Şeyx Məhəmməd Nasir əd-Din əl-Əlbani

*Sanki Onu Görürmüşsən Kimi*

# PEYĞƏMBƏRİN NAMAZI

*təkbirdən təslimədək*



## MÜQƏDDİMƏ

Bəndələrinə namazı vacib bilən, onu qılmağı və kamil şəkildə yerinə yetirməyi buyuran, uğuru və zəfəri ona əməl etməklə bağlayan, onu imanla küfr arasında səddə, əxlaqsızlıq və harama qarşı maneəyə çevirən Allaha həmd olsun!

Allah təalanın **«...Sənə də Quranı nazil etdik ki, insalara onlara göndəriləni (*hökmləri, halal-haramı*) izah edəsən...»** *(ən-Nəhl, 44)* deyib müraciət etdiyi Peyğəmbərimiz Məhəmmədə Allahın salavatı və salamı olsun! Allahın salavatı və salamı olmuş peyğəmbər bu vəzifəni tam şəkildə yerinə yetirdi, namazın insanlar üçün ən böyük vəzifələrdən olduğunu həm sözdə, həm də əməldə göstərdi. Bir dəfə Peyğəmbər (*səlləllahu aleyhi və alihi və*

*səlləm - Ona və ailəsinə Allahın salavatı və salamı olsun!*) hətta minbərdə qiyam və rüku ilə namaz icra edərək demişdir: "*Bunu etdim ki, məni təqlid edəsiniz və mənim necə namaz qıldığımı öyrənəsiniz* (əl-Buxari və Müslim).

Namaz qılmaqda ondan nümunə götürməyi vacib bilərək demişdir: "*Mənim necə namaz qılmağımı gördünüzmü, o cür də namaz qılın* (əl-Buxari, Müslim, Əhməd). Bizə belə bir müjdəni çatdırmışdır ki, onun kimi namaz qılanın cənnətə daxil olacağı barədə Allahın dərgahında vəd vardır və demişdir: "*Qüdrət və Cəlal sahibi Allah beş dəfə namazı vacib bilmişdir; onların dəstəmazını, vaxtında icrasını, tam rükusunu, səcdəsini və itaətkarlıqla icrasını ən gözəl və ən yaxşı iş hesab etmişdir. Bu qaydalara əməl edənin məğfirət qazanması barədə Allahın vədi vardır. Bunu etməyən Allahdan belə vəd qazana bilməz. Allah istəsə, onu bağışlar, istəsə, cəzalandırar* (Əbu Davud, "Səhih 451 və 1276-cı hədislər).

Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* ibadətini, namazını, kəlamlarını, əməllərini bizə çatdıran, yalnız onları özlərinə, ardıcıllarına, davamçılarına və qiyamət gününədək onların yolunu tutanlara məzhəb və

nümunə edən mömin və pak ailəsinə və əshabələrinə də salavat və salam olsun!

Hafiz əl-Munzirinin (*rahmətullahi aleyh - Allah ona rəhmət etsin!*) **“**Tərğib-tərhib kitabından namaz fəslini bəzi qardaşlarımla dörd il bundan qabaq oxuyub qurtarandan sonra namazın İslamdakı yeri, onu gözəl tərzdə icra edənin qazandığı əcr, kəramət və fəziləti hamımıza aydın oldu. Bu, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* namazına yaxınlıq və ya uzaqlıq dərəcələrinə görə fərqlənə bilər. O bu barədə buyurur: “*Bəndə namaz qılarkən savabın (necə qılmasından asılı olaraq) yalnız onda biri, doqquzda biri, səkkizdə biri, beşdə biri, dörddə biri, üçdə biri və yarısı qədər savab qazanar* (Səhih hədisdir. İbn Mübarək, “əz-Zühd, (10/21/1-2), Əbu Davud və ən-Nəsai “Səhih, 761-ci yaxşı hədis).

Buna görə də mən qardaşlarımı xəbərdar edirəm ki, əgər biz namazı düzgün qılmaq istəyiriksə, onda Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* tərəfindən namazın icra tərzini, onun vacib cəhətlərini, tərkibini, dualarını və zikrlərini bilməli və bütün bunları əməli olaraq yerinə yetirməliyik. Yalnız bu halda namazımızın bizi qəbahət və

küfrdən xilas edəcəyinə, onun gətirdiyi savab və əcrin bizə qismət olacağına əmin ola bilərik.

Adamların əksəriyyəti, o cümlədən alimlərin çoxu müəyyən bir məzhəbi rəhbər tutduqları üçün bütün bunları tam şəkildə bilməsi çətindir. Pak sünnə yoluna xidmət edən hər bir şəxs - istər müsəlman hüququ (fiqh), istərsə də hədis elmilə məşğul olan olsun - bilir ki, hər bir məzhəbin yalnız onun özünə məxsus olan qaydaları var və onların hamısında elə kəlamlar və əməllər vardır ki, bunları heç cürə Peyğəmbərə *–səlləllahu aleyhi və alihi və səlləm-* şamil etmək olmaz. Bu fikirlərə daha çox sonrakı dövr alimlərinin əsərlərində rast gəlmək olar.[1] Onlar çox zaman bunu Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* şamil etməyə çalışmışlar. Buna görə də hədis alimləri Allah onlardan razı olsun hədis kitabları yazıb onlardan səhih, zəif

[1] Əbu Həsənat əl-Ləknəvi öz "əl-Cami əs-Sağir adlı əsərində Hənəfi fiqh məktəbinə aid kitabları sadalayıb onlardan hansına istinad etdiyini, hansına etmədiyini göstərərək yazır: "Qeyd etdiyimiz əsərlər fiqh məsələləri üzrə tərtib olunmuşdur. Onların tərtibatı peyğəmbər hədislərinə əsaslanmır.

Ən tanınmış fiqh alimlərinin belə istinad etdikləri neçə kitab qondarma hədislərlə doludur? Xüsusilə, əl-Fətavi bizə bu məsələni geniş şəkildə aydınlaşdıraraq göstərdi ki, onların müəllifləri elmdə kamil olsalar da, hədisləri nəql etməkdə güzəştə getmişlər (səh.122-123).

və yaxşı hesab edilən hədisləri müəyyənləşdirdilər. Bu kitablardan aşağıdakıları göstərmək olar: “Əl-inayə bi mərifəti əhadis əl-hidayə və “Ət-turuq vəl vəsail fi təxric əhadis xulasə əd-dəlail. Hər iki kitab Şeyx Abdul-Qadir Məhəmməd əl-Quraşi əl-Hənəfiyə məxsusdur. Həmçinin Hafiz əz-Zeylənininin “Nasbu ər-rayə li-əhadis əl hidayə, Hafiz İbn Həcər əl-Əsqalaninin “əd-Dirayə və “Təlxis əl-həbir fi təxrici əhadisi ər-Rafi əl-kəbir və başqa çoxsaylı əsərləri göstərmək olar.

## KİTABIN YAZILMASI SƏBƏBİ

**BU** mövzuda tam əhatəli bir əsərə rast gəlmədiyim üçün öz ibadətlərini Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* yoluna uyğun etmək istəyən müsəlman qardaşlarım üçün imkan daxilində təkbirdən təslimədək Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* namazı ilə bağlı hər şeyi əhatə edən bir kitab yazmağı özümə vacib bildim. Elə bir kitab ki, Peyğəmbəri *-səlləllahu aleyhi və alihi və səlləm-* sidq-ürəklə sevən, onun “*Mənim necə*

*namaz qıldığımı görmüsünüz, elə namaz qılın* əmrini gerçəkləşdirmək istəyənlərin işini asanlaşdırmış olsun.

Buna görə də qollarımı çırmayıb bu məsələ ilə bağlı müxtəlif hədis kitablarını araşdırdım. Nəticədə indi sizə təqdim olunan bu əsər meydana gəldi. Şərəfli hədis qaydaları və əsaslarına uyğun olaraq peyğəmbər hədislərindən yalnız sənədi sübut olunmuş hədisləri burada qeyd edəcəyimə söz verdim. Çünki mənim etiqadıma görə, sənədinin doğruluğu sübuta yetmiş hədis olan yerdə zəif hədisə ehtiyac yoxdur, çünki, zəif hədis zənndən başqa fayda verməz. Allah təalanın buyurduğu kimi: **«...Zənn isə əsla həqiqət ola bilməz!»** *(ən-Nəcm, 28).*[*]

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurur: "*Zəndən çəkinin! Çünki sözlərin ən yalanı zənlə deyilənidir (əl-Buxari və Müslim)*. Allah təala bizə zənn əsasında ibadət etməyə icazə verməmiş, Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bunu qadağan edərək demişdir: "*Mənim barəmdə yalnız səhih hədisdən*

---

[*] Mübarək ayələrin tərcüməsində Z.Bünyadovun və V.Məmmədəliyevin müvafiq tərcüməsindən istifadə edilib.

*başqasından çəkinin*. Əgər zəif hədisin rəvayəti qadağan edilirsə, deməli, ona əməl etmək də qadağan edilir.

Kitab iki hissədən ibarətdir: *mətn* və *haşiyə*. Mətnə hədislər və onunla bağlı fikirlər daxildir. Kitabda ardıcıllığı saxlamaq üçün mətnlərin hər birini öz yerində qoydum. Hədisləri sünnə kitablarında varid olduqları kimi dəyişdirmədən verdim.

Verilən hədisin bir neçə rəvayəti varsa, müəlliflik və digər qaydalara uyğun olaraq, başqa rəvayətdəki fərqli sözləri “başqa rəvayətdə ifadəsi ilə bildirərək mətnə daxil etdim. Oxunuşu asanlaşdırmaq üçün bu mətnə daxil olan sözlərin hansı əshabədən nəql olunduğunu və bunu hansı hədis aliminin rəvayət etdiyini də qeyd etmədim.

İkinci hissə özlüyündə mətnin şərhidir. Hədis elminin qaydalarına riayət edərək verilmiş hədisləri dəqiqləşdirmiş, müxtəlif mənbələri tutuşdurmuş, müəyyən dəyişiklər aparmışam. Hədisin mənasına xələl gətirmədən müəyyən əlavələr də etmişəm. Əlavələri mötərizədə vermişəm. Əshabələrə məxsus rəvayətləri  ayrıca vermişəm.

Daha sonra hədis alimlərinin mənsub olduğu məktəblər (məzhəblər) haqqında danışıram. Onların

fikirlərinin müzakirəsini açıram, əldə etdiyim nəticələri qeyd edirəm. Həmçinin Sünnədə verilməyən bəzi məsələlər barədə öz fikirlərimi irəli sürürəm. Əlbəttə, həmin məzhəbləri təfsilatı ilə tədqiq etmək bu kitabın mövzusuna daxil deyildir.

Kitabın hər iki hissəsini birgə nəşr etdirmək istədik. Lakin obyektiv səbəblərə görə birinci hissəsini ayrıca çapa verib onu belə adlandırdıq: "***Sanki onu görürmüşsən kimi Peyğəmbərin (s.a.v.) namazı təkbirdən təslimədək***

Allah təaladan bu kitabı yalnız Onun razılığı üçün olan əməllərdən etməsini və onunla möminlərə fayda verməsini diləyirik. O, Eşidən və Cavab verəndir.

## KİTABIN METODU

**K**itabın mövzusu Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* namaz barədə göstərdiyi doğru yolun bəyan edilməsidir. Artıq yuxarıda qeyd etdiyimiz səbəbə görə müəyyən bir məzhəbdən asılı olmayıb istər qədim, istərsə də yeni dövr hədis alimlərinin məzhəblərində

olduğu kimi Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* haqqında sübuta yetirilmiş hədislərə əsaslandıq.

Bu sözlər çox yerində deyilmişdir: "Hədis əhli Peyğəmbər əhlidir; onun özü ilə söhbət etməmişlər, lakin onun kəlamlarının daşıyıcısı olmuşlar.

Buna görə də bu kitab, inşaallah, müxtəlif fiqh və hədis kitablarında verilən və mövzuya uyğun gələn hədislərin toplusu olacaqdır. Eyni zamanda heç bir kitabda və məzhəbdə öz əksini tapa bilməyən həqiqətlər də burada verilir. Buna əməl edən, inşaallah, Allahın doğru yola yönəltdiyi şəxs olacaqdır: **«...Onların ixtilafda olduqları həqiqətə Onun izni ilə iman gətirənləri Allah doğru yola yönəltdi...»** *(əl-Bəqərə, 213).*

Səhih hədislərə əsaslanmaq metodunu rəhbər tutaraq onu bu kitaba tətbiq etdim və bunun və digər əsərlərimin oxucular arasında geniş yayılacağına inanıram. Həm də bilirəm ki, bu heç də hamını razı salmayacaqdır. Onlardan bəziləri və ya çoxusu tənə və tənqid atəşini üstümə yağdıracaqdır.

Bununla mənə bir şey olmaz. Mən bilirəm ki, hamını razı salmaq heç də həmişə mümkün olmur. Ancaq: "*Allahı*

*qəzəbləndirməklə insanları razı salanı Allah insanlara möhtac edər* (ət-Tirmizinin rəvayəti. Səhih hədisdir).

Bu sözlər nə gözəl deyilmişdir:

*Hündür bir dağdakı mağara içində olsam da,*
*Qartalın qanadları altında gizlənsəm də,*
*İnsanların tənəsindən qurtula bilmərəm.*

Mən inanıram ki, bu, Allah təalanın möminlərə buyurduğu, peyğəmbərlər ağası Peyğəmbərimiz Məhəmmədin *-səlləllahu aleyhi və alihi və səlləm-* göstərdiyi, əməlisaleh əshabələrin, ardıcılların, onlardan sonrakıların, o cümlədən müsəlmanların mənsub olduğu, dörd məzhəb imamlarının tutduğu ən doğru yoldur.

Hamı hədislərə əsaslanmağın vacibliyini qeyd edir, onlara müxalif olan kəlamları rədd etməyi tələb edir. Hər hansı bir kəlam, fikir nə qədər əzəmətli olursa-olsun, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* şəni daha ucadır, göstərdiyi yol daha doğrudur. Buna görə mən də onların hidayət yolunu seçdim, onların izi ilə getdim, onların

hədislərə əsaslanmaq barədəki əmrlərini yerinə yetirdim. Bu əmrlər kitabın yazılma metodunu müəyyənləşdirdi və bu, ən doğru metoddur. Bu həm də kor-koranə təqliddən uzaqdır. Allah təaladan onları xeyirlə mükafatlandırmasını diləyirəm!



## İMAMLARIN SÜNNƏYƏ ƏMƏL ETMƏK VƏ ONA MÜXALİF OLAN SÖZLƏRİNİ TƏRK ETMƏK BARƏDƏ DEYİMLƏRİ

Bu yerdə rast gəldiyimiz deyimlərdən bəzilərini fayda üçün qeyd edəcəyik. Ola bilsin, bu, kor-koranə təqlid edənlərə bir moizə və xatırlatma olar. Bəziləri məzhəblərə və onlarda kök salmış fikirlərə elə bağlanmışlar ki, elə bil onlar göydən nazil olmuşlar. Qüdrət və Cəlal sahibi Allah buyurur: **«Rəbbinizdən sizə nazil edilənə (*Qurana*) tabe olun. Allahı qoyub başqa dostlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!»** *(əl-Əraf, 3).*

### [2]. ƏBU HƏNİFƏ *(Allah ona rəhmət eləsin!)*

Bu alimlərdən birincisi Əbu Hənifə ən-Numan bin Sabitdir (*rahmətullahi aleyh*). Məsləkdaşlarının onun haqqında çox müxtəlif fikir və ifadələri bizə gəlib çatmışdır. Onların hamısının bir mənası vardır: hədisə əməl etmək, imamların ona müxalif olan fikirlərini təqlid etməmək.

1- “Hədis səhihdirsə, deməli o, mənim məzhəbimdir.

2- “Dediyimiz sözün (fətvanın) mənbəyini bilmədən heç kimə ondan çıxış etmək (onunla əməl etmək) halal olmaz.

Rəvayətdə deyilir: “Mənim dəlilimi bilmədən dediyimlə fətva verməmk haramdır.

Başqa bir rəvayətdə deyilir: “Biz bəşər övladıyıq. Bu gün bir rəy deyirik, sabah başqa rəyi deyirik. Başqa bir rəvayətdə isə deyilir: “Ey Yaqub (Əbu Yusif)! Məndən eşitdiyin hər şeyi qələmə alma. Mən bu gün bir rəylə çıxış edirəm, sabah onu danıram. Sabah bir rəy deyərəm, birisi gün onu danaram.[2]

---

[2] Mən deyirəm: Bu ona görədir ki, Əbu Hənifə öz dediklərinin çoxusunda əvvəlcə qiyasa əsaslanır. Lakin sonra daha qüvvətli bir qiyas, və ya Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* hədisi ilə rastlaşır və bunları əsas götürdüyü üçün əvvəlki fikrindən əl çəkir. Əş-Şərani "əl-Mizan" əsərində yazır (2/62): "Bizim və imam Əbu Hənifə *–rahmətullahi aleyh-* haqqında insafla danışanların fikrincə əgər o, şəriətin tamamilə formalaşdığı dövrə qədər, onun ayrı-ayrı yerlərdə toplanıb tamamlandıqdan sonra da yaşasaydı ona əsaslanıb əvvəllər istifadə etdiyi qiyaslardan əl çəkərdi. Digər məzhəblərdə olduğu kimi, onun da məzhəbində qiyas az olardı. Lakin onun yaşadığı tabiinlər və onların ardıcılları dövründə şəriət dəlilləri müxtəlif şəhər və kəndlərdə pərakəndə halda verildiyindən və bu dəlillərin azlığı geniş şəkildə qiyasdan istifadə etmək zərurətini doğururdu. Bu da onun başqa imamlardan fərqli olaraq qiyasdan istifadə etdiyi məsələlərə aid hədislərin əldə olmamasından irəli gəlir. Hədis alimləri

3- “Əgər Allah təalanın Kitabına və Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm*- dediklərinə müxalif bir söz desəm, bu sözümü qəbul etməyin.[3]

---

sonradan hədisləri topladılar, təshih etdilər. Şəriət hədisləri bundan sonra bir-biri ilə uyğunlaşdılar. Əbu Hənifənin məzhəbində başqa məzhəblərlə müqayisədə qiyasdan daha çox istifadə edilmişdir".

Mənim fikrimcə, səhih hədislərdə qəsdən olmayan ziddiyyət Əbu Hənifə üçün üzürlü sayılmalıdır və bu üzür məqbuldur. Çünki Allah təala insana gücü çatdığı işi tapşırır. Bəzi nadanlar kimi bununla imama tənə etmək doğru deyildir. Əksinə, onunla nəzakətlə rəftar edilməlidir. Çünki Əbu Hənifə İslamı qoruyan, onun köklərini və şöbələrini bizə çatdıran müsəlman imamlarından biridir. O, istər haqlı olduğu, istərsə də səhv etdiyi hər bir halda əcr sahibidir. Lakin bəzi ifrata varanlar kimi, onun hədislərə xilaf olan fikirlərindən yapışmaq da doğru deyildir. Onun dediklərindən göründüyü kimi, bunlar onun məzhəbi deyildir. Onlar bir vadidə, bunlar isə o biri vadidədir. Həqiqət isə bunların arasındadır. Bu yerdə Rəbbimizin buyurduğunu xatırlamaq yerinə düşərdi: **«...“Ey rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş qardaşlarımızı bağışla! Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən!”»** *(əl-Həşr, 10)*.

[3] əl-Fulani öz "əl-İqaz" əsərində (səh. 50), Məhəmməd bin əl-Həsəndən nəql edərək yazır: “Bu və bu qəbildən olan sözlər müctəhidlərə aid deyildir. Çünki onların belə sözlərə ehtiyacı yoxdur. Bu təqlid edənlərə deyilən sözdür.

Bu sözə əsaslanaraq əş-Şərani öz “əl-Mizan əsərində (1/26) bu barədə yazır: "İmamın vəfatından sonra səhihliyi sübuta yetirilən, ancaq əməl olunmayan hədislərlə nə edək"-deyə sual versələr, bunun cavabı belədir: Sənə vacib olan imamın qəbul etdiyi və səhih bildiyi hədislərə əməl etməlisən. Əgər (təqlid etdiyin) imamına səhih hədis çatsaydı onda sənin əməlin ona uyğun olardı. İmamların hamısı şəriətin əsirləridir. Şəriətə əməl edən hər iki əli dolusu xeyir qazanmış olur. Bir çox imamları təqlid edənlər kimi hər kim “mən yalnız imamın qəbul etdiyi hədislə əməl edirəm demələri onları çox xeyirdən məhrum edir. Əksinə, alimlərin vəsiyyətini yerinə yetirərək hər bir

## [22]. MALİK BİN ƏNƏS (*Allah ona rəhmət eləsin!*)

Mərhum imam Malik bin Ənəs demişdir:

1- “Mən insanam, səhv də edirəm, düz də deyirəm. Mənim dediklərimə diqqətlə fikir ver. Kitaba və Sünnəyə uyğun gələnləri qəbul et, Kitab və Sünnəyə uyğun gəlməyənləri isə rədd et.[4]

2- “Peyğəmbərdən -*səlləllahu aleyhi və alihi və sәlləm*- başqa hər kəsin sözü qəbul və rədd oluna bilər.[5]

3- İbn Vahb demişdir: “Dəstamaz vaxtı ayaq barmaqlarının təmizlənməsi barədə Malikə sual verildi. Onun cavabı belə oldu: “Bunu etmək düzgün deyildir. İbn Vahb deyir: “Gözlədim, adamlar bir az seyrəldikdən sonra

---

səhih hədislə əməl etmək onlar üçün daha xeyirli olardı. Biz əminik ki, əgər imamlar bu hədislər dövründə yaşasaydılar və onları bilsəydilər onda mütləq onları qəbul edərdilər, onlara əməl edərdilər. İstifadə etdikləri bütün qiyaslardan, dedikləri fikirlərdən əl çəkərdilər".

[4] İbn Abdul-Bərr “əl-Camidə (2/32), İbn Həzm “Usulul-əhkamda (6/149) və əl-Fulani (səh.72) bu rəvayəti verirlər.

[5] Bu sözlər bir çox sonrakı dövr Maliki alimlərinin əsərlərində Malikə şamil edilir. Bu müəlliflərdən İbn Abdul-Hadini, İbn Abdul-Bərri və İbn Həzmi göstərmək olar.

dedim ki, axı bu bizdə sünnədə vardır. Dedi: “Hansı hədisdə? Dedim: “Mən Leys bin Səəddən, o da bin Luheya və Amr bin Haris əl-Maarifidən onlarda Əbu Abdur-Rəhman əl-Həblidən o da Müstəvrid bin Şəddad əl-Quraşidən rəvayət etdilər ki, o demişdir: “Allahın rəsulunun çeçlə barmağıyla ayağının barmaqlarının arasını yuduğunu gördüm. İmam Malik dedi: “Bu həsən hədisdir. Onu yalnız indi eşitdim. Bu hadisədən sonra bu barədə soruşulanda, barmaqların arasını yumağı əmr edərdi.[6]

## 222. ƏŞ-ŞAFİİ (*Allah ona rəhmət eləsin!*)

Mərhum imam əş-Şafiidən daha çox hikmətli fikirlər gətirmək olar.[7] İmamın ardıcılları onun göstərişlərinə əməl etmişlər. Onun fikirlərindən bir neçə nümunə verək:

---

[6] İbn Əbu Hatəmin “əl-Cərh vat-tədil əsərinin müqəddiməsində (səh.31-32), əl-Beyhəqinin “əs-Sünən (1/81) əsərində rəvayət edilir.

[7] İbn Həzm yazır (6/118): "Təqlid edilən fəqihlərin özləri təqlidi rədd etmişlər. Onlar öz məsləkdaşlarını təqliddən uzaqlaşdırırdılar. Bu sahədə əş-Şafii xüsusilə fərqlənmişdir. Mərhum imam səhih hədislərə sadiq olmuşdur. Sübuta ehtiyacı olanlar sahəsində daha irəli getmişdir. Təqlid edilməkdən uzaqdır. Özü bu barədə danışmışdır. Allah da bu işdə onun əcrini artırmışdır.

1- “Elə bir adam yoxdur ki, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsi ona aid olmasın və ya ondan uzaq olsun. Mən nə deyirəmsə və ya hansı bir fikri əsaslandırıramsa, əgər Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurduğu mənim dediyimə ziddirsə, həqiqi olan Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* dediyidir. Bu elə mənim də dediyimdir *(əl-Hakimin əş-Şafiiyə istinadən verdiyi rəvayət).*

2- “Müsəlmanlar belə bir ümumi fikirdədirlər ki, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsini aydın görən bir şəxs başqa birisinin dediyini ondan üstün tuta bilməz *(İbn əl-Qayyim, 2/361 və əl-Fulani, səh. 68).*

3- “Mənim kitabımda Rəsulullahın *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsinə müxalif bir fikir tapsanız, onda Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsini əsas götürün. (başqa rəvayətdə: “ona tabe olun, “başqasının fikrinə uymayın) *(İbn Asəkir, İbn əl-Qayyim, əl-Fulani və b.).*

4- “Əgər hədis səhihdirsə deməli mənim məzhəbim odur *(ən-Nəvəvi, əş-Şərani, əl-Hakim, əl-Beyhəqi, əl-Fulani)*[8].

---

[8] Əş-Şərani yazır: “İbn Həzm demişdir: Yəni, onun və ondan başqa imamların səhih bildikləri hədislər.

5- “Siz (yəni imam Əhməd bin Hənbəl) hədisi və onu rəvayət edənləri məndən daha yaxşı bilirsiniz. Əgər səhih hədis varsa, mənə deyin. Kufəlidə, bəsrəlidə və ya şamlıda olsa belə gedim öyrənim.[9]

6- “Hər bir məsələdə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* haqqında hədis alimlərinin verdiyi məlumat səhih olub mənim dediyimə müxalifdirsə, sağlığımda və ölümümdən sonra da mən öz dediyimdən dönürəm *(Əbu Nəim, əl-Hərəvi, İbn əl-Qayyim, əl-Fulani).*

7- “Görsəniz ki, mən bir söz deyirəm, lakin o Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* səhih kəlamına müxalifdirsə, onda, deməli, mənim ağlım çaşıbdır *(İbn Əbi Hatim, Əbulqasim əs-Səmərqəndi, Əbu Nəim rəvayət etmişlər).*

---

[9] Deyirəm: “hətta əgər onların atalarına və alimlərinə qarşı mü-nasibətdə bunu etsələr haqlı olarlar. ət-Təhavi yaxşı istinadla Səlm ibn Abdullah ibn Ömərdən rəvayət edir: “İbn Ömərlə məsciddə oturmuşdum. Şamlı bir kişi gəlib Həcc vaxtı ümrə barədə soruşdu. İbn Ömər dedi: “Çox yaxşı və gözəl əməldir. Kişi soruşdu: “Əgər atan bunu qadağan etsəydi? İbn Ömər dedi: “Vay halına! Əgər atam bunu qadağan etsəydi, deməli bu qadağanı Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* əmr etmişdir. Sən atamın dediyini əsas götürürsən, yoxsa Rəsulullahın. Kişi dedi ki, əlbəttə, Rəsulul-lahın. İbn Ömər axırda dedi: “İndi get! (Əhmədin rəvayəti (5700), ət-Tirmizinin rəvayəti (2182).

8- “Mənim dediyim hər hansı bir fikir Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm-* səhih hədislərinə müxalifdirsə, bilin ki, Peyğəmbər hədisi daha irəlidir, məni təqlid etməyin *(İbn Əbi Hatim, Əbu Nəim, İbn Asəakir rəvayət etmişlər).*

9- “Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm-* hər bir hədisi, dilimdən səslənməsə də, mənim sözümdür *(İbn Əbi Hatim).*

## [2]V. ƏHMƏD BİN HƏNBƏL (*Allah ona rəhmət eləsin!*)

İmam Əhməd hamıdan çox hədislərin toplanması ilə məşğul olmuş, onlara əməl etmişdir. Deyirlər ki, “o hətta başqa variantları və rəyləri əhatə edən kitabların yazılmasının əleyhinə olmuşdur *(İbn əl-Cauzi, "əl-Mənaqib", səh. 192).*

Onun irəli sürdüyü fikirlər:

1- “Nə məni, nə də Maliki və əş-Şafiini təqlid edin. Həmçinin əl-Auzaiini, əs-Saurini təqlid etməyin. Onların əxz

etdiyi mənbələrdən siz də götürün *(əl-Fulani, İbn əl-Qayyim)*.

Bir rəvayətdə deyilir: “Dinində bunlardan heç birini təqlid etmə. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* və onun əshabələrinin, onların ardıcıllarının, bunlardan sonra gələnlərin isə rəylərini seçərək (səhihi, zəifdən ayıraraq) götürün.

Başqa bir rəvayətdə demişdir: “Ardıcıllar Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* və onun əshabələrinin dediklərinə əsaslanan şəxsin ardınca gedənlərdir. Tabiinlərdən sonra isə əməlisaleh xeyirxah adamların dediklərini seçərək götürün *(Əbu Davud, "İmam Əhmədin məsələləri", səh. 276-277)*.

2- “Əl-Auzainin, Malikin və Əbu Hənifənin fikri fikir olaraq qalır. Onlar mənim üçün eynidirlər. Dəlil-sübutu isə əsərlərdə (Quranda və hədislərə) axtarmaq lazımdır *(İbn Abdul Bərr, "əl-Cami", səh.2/149)*.

3- “Rəsulullahın (s.s) hədisini rədd edən həlak olmaq üzrədir *(İbn əl-Cauzi, səh.183)*.

Bunlar hədisə əməl etmək və onları kor-koranə təqlid edilməsini rədd etmək barədə imamların (*Allah onlardan*

*razı olsun! -radıyallahu anhum*) fikirləridir. Bu fikirlər o qədər açıq-aydındır ki, heç bir mübahisəyə və ya şərhə ehtiyac yoxdur. Sünnəyə mültəzim olmaq, imamların bəzi fikirlərinə qarşı çıxan şəxs heç də onların təlimlərini rədd etmir, onların qoyduğu yoldan sapmır. Əksinə, bu şəxs onların hamısını qəbul edir, onlarla qırılmaz tellərlə sıx bağlı olur. Sabit Sünnəni onların dedikləri ilə uyğunlaşmadığına görə qəbul etməyən şəxs bu imamların özlərinə qarşı da asilik etmiş olur, onların dediklərinə qarşı çıxır. Həm də Allah təalanın bu kəlamına qarşı olur: **«Amma, xeyr! (***Ya Məhəmməd***) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar»** *(ən-Nisa, 65)*. Allah təala həmçinin buyurur: **«...Onun (***Peyğəmbərin***) əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!»** *(ən-Nur, 63)*.

Hafiz İbn Rəcəb *–rahmətullahi aleyh-* demişdir: "Peyğəmbərin əmrindən xəbardar olan, hədisi bilən hər kəsə bunu millətə bəyan etməyi, nəsihət etməyi, ona tabe olmağı nəsihət etməlidir. Əgər bu məşhur bir alimin fikrinə müxalif

olsa belə bunu etməlidir. Şübhəsiz ki, hər hansı bir məsələdə xəta etməsi istisna olmayan məşhur alimdənsə, Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* tabe olmaq düzgündür. Buna görədə əshabələr və ondan sonra gələn alimlər səhih sünnəyə müxalif olanları rədd etmişlər. Bəzən bu cavablar sərt olmuşdur. Bu sərt cavablar nifrətdən irəli gəlmirdi. Onları (alimləri) (Allah üçün) sevirdilər. Ancaq Allah rəsulunu isə onlardan da çox sevirdilər. Şübhsiz ki, hər hansı bir alimin fikri peyğəmbərin sözünə zidd olarsa peyğəmbərin sözü götürülməlidir. Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurduğu kimi, xətasına görə də savab qazanmış bu alimin fikrini qəbul etməmək ona qarşı hörmətsizlik deyildir.

Bu fikir barədə mən deyərdim: "Onlara necə nifrət etmək olar ki, bu imamlar öz ardıcıllarına, artıq yuxarıda göstərdiyimiz kimi, onlara Sünnəyə tabe olmağı, peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* səhih Sünnəsinə müxalif olanlarla əməl etməməyi əmr etmişlər.

Mərhum əş-Şafii *–rahmətullahi aleyh-* öz məsləkdaşlarına müəyyən bir məsələdə hədislərə əsaslanmadıqda və ya onların əksinə olana əsaslandıqda səhih Sünnəni ona aid etməyi əmr etmişdi. Mərhum

tədqiqatçı İbn Dəqiq əl-İd bu dörd imamın ayrı-ayrılıqda və ya bütövlükdə səhih hədislərə uyğun gəlməyən fikirlərini iri cildli bir kitabda toplamış və sonra bu sözləri yazmışdır: "Bu fikirləri müctəhid imamlara aid etmək olmaz. Təqlidçilər bunu bilməlidirlər ki, bu fikirləri onlara şamil edib onlara böhtan atmasınlar *(əl-Fulani, səh. 99)*.

## ARDICILLARIN İMAMLARIN BƏZİ FİKİRLƏRİNİ RƏDD EDİB SÜNNƏYƏ ƏSASLANMASI

**B**una görə də imamların ardıcıllarının **«çoxu əvvəlkilərdən, bir az da sonrakılardandır»** *(əl-Vaqiə, 13-14)*. Onlar imamların dediklərini bütünlüklə qəbul etməmiş, Sünnəyə müxalif olduğuna görə bir çoxunu rədd etmiş, hətta mərhum imamlar Məhəmməd bin əl-Həsən və Əbu Yusif "məzhəbin təqribən üçdə biri qədər öz şeyxləri Əbu Hənifəyə müxalif olmuşlar *(İbn Abidin, "əl-Haşiyə", 1/62)*.

Bunu sübut edən kitabların sayı kifayət qədərdir. İmam əl-Muzani[10] və Şafii məzhəbinin bir çox başqa ardıcılları da bu mövqedən çıxış etmişlər. Dediklərimizi sübuta yetirmək üçün çoxsaylı misallar gətirə bilərik ki, bu da uzunçuluğa gətirib çıxarar və qarşımıza qoyduğumuz əsas məqsəddən bizi uzaqlaşdırar. Ona görə də iki misalla kifayətlənək:

1- İmam Malik "əl-Muvatta əsərində (səh: 158) qeyd edir ki, Məhəmməd demişdir: "Əbu Hənifə *–rahmətullahi aleyh-* yağış yağdırmaq üçün namazı qəbul etmirdi. Bizim fikrimizcə isə, bu halda imam camaatla iki rükət namaz qılır və sonra dua edir[11] və i.a.

2- İmam Əhməd Məhəmmədin *-səlləllahu aleyhi və alihi və səlləm-* əshabələrindən biri və imam Əbu Yusifin ardıcılı olan Usam bin Yusif əl-Bəlxi Əbu Hənifənin dediklərinə uyğun gəlməyən bir çox fətvalar vermişdir. Çünki əlində bu dəlillər yox idi. Başqa bir dəlil tapdığı üçün

[10] O, əş-Şafiinin "əl-Umm kitabının haşiyəsində çap olunmuş "əş-Şafiinin müxtəsər fiqhi kitabının müqəddiməsində bunu deyir: "Bu kitab Məhəmməd ibn İdris əş-Şafiinin *–rahmətullahi aleyh-* kəlamlarının qısa xülasəsidir. Onun kəlamının mənası barədə deməliyik ki, o özünü və başqasını təqlid etməyi yasaq etmişdir.

[11] O təqribən 20 məsələdə öz imamına müxalif olduğunu bildirmişdir.

ona əsasən fətva verərdi. Pehğəmbərin mütavatir sünnəsinə müvafiq olaraq rüku edərkən və ondan qalxanda əllərini qaldırardı. Üç məşhur alimin (Əbu Hənifə, Malik, Əhməd) buna müxalif fətva verməsi ona bu hədislə əməl etməkdə mane olmadı. Belə ki, rüku vaxtı və ondan qalxanda əllərini qaldırardı.[12] Bu, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsinə uyğun idi və ona əməl etmək yasaq edilmirdi.

*Xülasə,* istəmirəm ki, təqlidçilərdən hər hansı biri bu kitabın əsas qayəsinə zidd getsin, bu və ya başqa məzhəbin göstərişlərinə uyğun olmadığı üçün orada olan peyğəmbər sünnəsini istifadə etməsin. Əksinə istərdim ki, yuxarıda qeyd etdiyimiz imamların sünnəyə əməl etməyin vacibliyini, ona müxalif olan fikirləri kənara qoymaq barədə sözlərini xatırlasınlar. Bu kitabın məğzinə tənə etmək, o təqlid olunan imamlardan hansı olursa olsun, ona tənə etməkdir. Çünki bu yolu yuxarıda qeyd etdiyimiz kimi, onlardan götürmüşük. Kim düz yolla getmək üçün qoyulmuş bu yoldan üz çevirərsə, o böyük təhlükə qarşısındadır. Çünki Allahın

---

[12] Mən deyirəm: “Burada Əbu Hənifə barədə aşağıdakı rəvayətin düzgün olmaması aydın olur: "Əlləri yuxarı qaldıranın namazı pozulur.

buyurduğu kimi - : **«Amma, xeyr! (***Ya Məhəmməd***) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar»** *(ən-Nisa, 65)* – hər bir ixtilaflı məsələdə dönüş yerimiz olan, etimad göstərməmiz lazım gələn sünnəyə üz tutmağımızdır.

Allah təaladan istəyirəm ki, bizi Özünün dediyi: **«Aralarında hökm vermək üçün Allahın və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: "Eşitdik və itaət etdik!" – deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır! Allaha və Onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər – məhz belələri uğura çatanlardır»** *(ən- Nur, 51-52)* kimilərdən etsin.

*Dəməşq,*

*13 cəmadi əl-axır 1370 h.*



## ŞÜBHƏLƏR VƏ ONLARIN CAVABI

**ON** ildən bəri bu kitabın müqəddiməsində bunları yazmışam. Bu qısa müddət ərzində bizə aydın oldu ki, bu kitabın mömin gənclərə müsbət təsiri olmuş, onları öz din və ibadətində İslamda yeganə pak ibadət mənbəyi olan Kitab və Sünnəyə qayıdışa yönəltmək işində mühüm rol oynamışdır. Onlar arasında, Allaha şükür ki, Sünnəyə əməl edib ona etimad edənlərin sayı artıb geniş şəkildə yayılmışdır. Mən onların çoxunda Sünnəyə əməl etmək rəğbətini hiss etdim. Şübhəsiz ki, Sünnəyə qayıdış əmrini verən imamların dedikləri barədə ayələri və xəbərləri sadaladıqdan sonra bu, belə də olmalı idi. Lakin bu gənclər hələ də bəzi təqlidçi şeyxlərdən şübhə doğuran sözlər eşidirlər. Buna görə də onları sadalamağı və onlara cavab verməyi lazım bildim. Ola bilsin ki, bundan sonra bəziləri Sünnəyə əməl edən və Allahın izni ilə nicat tapmış toplumdan olsunlar.

1- Bəziləri demişlər: Dini işlərdə, xüsusilə namaz kimi sırf ibadət məsələsində Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* yolunu tutmaq vacibdir. Bu barədə nə başqa rəyə gəlmək, nə də başqa fikir yürütmək olar. Çünki bu, ilahi işdir. Lakin biz hələ də təqlidçi şeyxlərdən heç birindən bunu eşitmirik, əksinə, onlar fikir ayrılığı olmasını dəstəkləyirlər. İddia edirlər ki, bu, millətə genişlik, rahatlıq vermək qəbildəndir. Öz iddialarını əsaslandırmaq üçün Sünnə tərəfdarlarına cavab olaraq dəfələrlə gətirmiş olduqları bir hədisi misal göstərirlər: "*Mənim millətimin ixtilafı mərhəmətdir"*. Bizə aydın olur ki, bu hədis sizin insanları dəvət etdiyiniz, yazdığınız bu və başqa kitabların əsaslandığı metodun əksinədir. Sizin bu hədis barədə rəyiniz nədir?

Cavab iki cürdür:

*Birincisi*, bu hədis səhih deyildir; batildir, əsli yoxdur. Böyük alim əs-Sübki demişdir: "Onun üçün nə səhih, nə zəif, nə də ki, qondarma bir istinad tapa bildim.

Mən deyirəm ki, bu cür formada rəvayətlər vardır: "*Əshabələrimin ixtilafı sizə mərhəmətdir* və "*Əshabələrim ulduzlar kimidir, hansının yolu ilə getsəniz hidayət*

*taparsınız”*. Hər ikisi səhih deyildir. Birincisi çox zəifdir. İkincisi qondarmadır. Bu hədisləri “Zəif və qondarma hədislər silsiləsi əsərində (səh. 58, 59 və 61) tədqiq etmişəm.

*İkincisi*, hədis öz zəifliyi ilə yanaşı Qurani-Kərimə də ziddir. Dində ixtilafı inkar edən və ittifaqı əmr edən ayələr o qədər məşhurdur ki, qeyd edilməsə də olardı. Lakin bəzi ayələri misal gətirmək pis olmaz. Allah təala buyurur:

**«Bir-birinizlə çəkişməyin, yoxsa qorxub zəifləyər və gücdən düşərsiniz»** *(əl-Ənfal, 46);*

**«Tövbə edərək Ona tərəf dönün, Ondan qorxun, namaz qılın vəmüşriklərdən olmayın! O kəslərdən ki, öz dinini parçalayıb firqə-firqə oldular...»** *(ər-Rum, 31-32);*

**«Əgər Rəbbin istəsəydi, bütün insanları tək bir ümmət edərdi. Onlar hələ də ixtilafdadırlar. Rəbbinin mərhəmət etdiyi kimsələr istisnadır...»** *(Hud, 118-119)*.

Əgər ixtilafda olmaq Rəbbin mərhəmətidirsə, onda batil əməl sahibləri həmişə ixtilafdadırlar. Necə ola bilər ki, ixtilaf mərhəmət olsun?

Sübut edilmişdir ki, bu hədisin nə sənədi, nə də mətni səhih deyildir. Onda aydındır ki, ona əsaslanıb imamların

əmr etdiyi kimi Kitab və Sünnəyə əməl etməyi şübhə altına almaq olmaz.

2- Başqaları demişlər: əgər dində ixtilaf yasaq edilibsə, bəs onda əshabələrin və onlardan sonra imamların ixtilafda olmalarına nə deyirsiniz? Məgər onların ixtilafı ilə sonrakı alimlərin ixtilafı arasında fərq varmı?

Cavab: Bəli, bu iki ixtilaf arasında böyük fərq vardır. Bu özünü iki amildə göstərir:

Birinci: İxtilafın səbəbi.

İkinci: Onun nəticəsi.

Əshabələr arasındakı ixtilaf başa düşmək zərurətindən doğurdu və təbii ixtilaf idi. Bu, ixtilaf xatirinə ixtilaf deyildi. Bura həm də onların zamanında mövcud olmuş, ixtilafı meydana gətirmiş və sonradan aradan getmiş amilləri də əlavə etmək olar. Bu növ ixtilafdan tamamilə xilas olmaq mümkün deyildir. Həm də bu ixtilafa görə yuxarıda qeyd edilən ayələrdə irəli sürülən töhmət onu törədənlərə aid edilmir. Belə ki, burada bu ixtilafın qəsdən və və üzərində israrla durma şərti müəyyənləşdirilmişdir.

Təqlidçilər arasındakı ixtilafa gəldikdə, deməliyik ki, onu törədənlərə əksər hallarda üzr yoxdur. Çünki bəzilərinə

Kitab və Sünnədən dəlil aydın olmasına baxmayaraq, o başqa məzhəbin fikrinə uyğun olduğuna görə, mənsub olduğu məzhəbin fikrinə müxalif olduğuna görə onu kənara qoyur. Sanki mənsub olduğu məzhəb dinin əslidir və ya Məhəmmədin *-səlləllahu aleyhi və alihi və səlləm-* gətirdiyi din məhz odur. Başqa məzhəb isə hökmü ləğv olunmuş başqa bir dindir.

Təqlidçilərin başqa bir qrupu isə bunun əksinə olaraq bütün məzhəbləri aralarındakı geniş ixtilafa görə müxtəlif şəriətlər kimi qəbul edir. Sonrakı dövrün alimləri bu fikri açıq şəkildə ifadə edirlər *(Bax: əl-Mənavi, "Feyz əl-Qədir", 1/209 və "Zəif hədislər silsiləsi", 1/76 və 77).* Müsəlman üçün onlardan birini qəbul etmək, digərini isə rədd etməkdə bir sıxıntı yoxdur. Çünki hamısı şəriətdir. Onlar bir-birilə ixtilafda olmaqla yanaşı bu batil hədisə əsaslanırlar: "*Mənim ümmətimin ixtilafı mərhəmətdir.* Onlardan bəziləri bu hədisi şərh edərək deyirlər ki, ixtilaflar hər halda mərhəmət olmuşdur. Çünki o, millətə geniş imkanlar yaradır. Lakin bu şərh yuxarıda qeyd edilən açıq və aydın ayələrə, imamların kəlamlarına ziddir. Bir çoxları bu fikrə belə cavab verirlər: İbn əl-Qasim demişdir: "Mən Malikdən və Leysdən onların belə dediklərini eşitmişəm ki, Rəsulullahın *-səlləllahu aleyhi*

*və alihi və səlləm-* əshabələrinin ixtilafı barədə insanların dediyi kimi “bu, millət üçün geniş imkanlar açır deyilməsi səhvdir. Bu, belə deyildir. Çünki ixtilaflı iki fikrin biri səhv, o biri doğrudur.

Əşhəb demişdir: “Malikdən Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* əshabələrindən inamlı şəxsin rəvayəti ilə gəlmiş fikrləri barədə soruşmuşlar: Bu fikirlərdə geniş imkanlar (hər biri ilə əməl etmək) görürsənmi? Malik demişdir: “Vallahi, haqqa isabət etməyincə yox! Haqq yalnız birdir. Məgər iki müxtəlif fikrin hər ikisi doğru ola bilərmi? Həqiqət yalnız tək ola bilər.

İmam əş-Şafiinin ardıcıllarından olan əl-Muzəni demişdir: “Rəsulullahın *-səlləllahu aleyhi və alihi və səlləm-* əshabələri bir-birilə ixtilafda olmuş, fikirləri diqqətlə öyrənmişlər, şərh etmişlər. Hər birinin fikri doğru olsaydı, belə etməzdilər. Ömər bin əl-Xəttab, Ubeyy bin Kəb ilə İbn Məsud arasında namazın bir paltarda qılınması barəsində ixtilaf xəbərini eşidəndə bərk qəzəblənir. Belə ki, Ubeyy demişdi ki, bir paltarda namaz qılmaq yaxşıdır, gözəldir. İbn Məsud isə demişdi ki, bunu o zaman demək olar ki, paltar az olsun..."

İbn Abdul-Bərr demişdir: “Bir-birinə əks olan fikirlər doğru olsaydı, keçmiş alimlər öz fətvalarında, hökmlərində və iddialarında bir-birinin xəta etdiyini deməzdilər. Bir fikir və onun əksi eyni zamanda hər ikisi doğru ola bilməz. Düz deyiblər ki, bir-birinə zidd iki fikri isbat etmək cəhdi mümkün olmayan bir şeyi etməkdən daha iyrənc bir işdir.

İbn Kəsir demişdir: “İxtilafın rəhmət deyil, bütünlükdə şər olması sübut edilmişdir. Lakin elə ixtilaf var ki, ona görə insan günah qazanar. Məsələn, məzhəbinə təəssübkeşlik edənlərin ixtilafı. Elə ixtilaf da var ki, ona görə günah yazılmır. Məsələn, əshabə və tabiinlərin bir-biri arasında olan ixtilaf. Allah bizi bu sonuncular zümrəsinə daxil etsin və onların ardınca getməyə müvəffəq etsin!

Göründüyü kimi əshabələrin ixtilafı təqlidçilərin ixtilafı ilə eyni deyildir.

*Xülasə*, əshabələr məcburiyyət üzündən ixtilafda olmuşlar. Onlar ixtilafı inkar etmiş və imkan tapan kimi ondan qaçmışlar.

Təqlidçilər isə ixtilaflardan və ya onların çoxusundan xilas imkanına malik olsalar da, bir-birilə razılığa gələ bilmirlər və buna səy etmirlər. Əksinə, öz fikirləri üstündə

israr edir, zidd mövqelərdə dururlar. Bu iki növ ixtilaf arasında böyük fərq vardır. Bu fərq səbəb baxımındandır.

Nəticə baxımından fərq barədə bunları deyə bilərik: bu fərq aydındır. Əshabələr *–radıyallahu anhum- Allah onlardan razı olsun-* ikinci dərəcəli məsələlərdə ixtilafda olsalar da, öz aralarında birliyi möhkəm qorumuşlar, fikirləri haçalayan, sıraları parçalayan hər şeydən uzaq olmuşlar. Məsələn, onlardan elələri olmuşdur ki, "*bismilləh*in bərkdən deyilməsinin şəriətə uyğunluğunu irəli sürmüş, digərləri isə bunu inkar etmişlər. Elələri olmuşdur ki, namaz vaxtı əllərin yuxarı qaldırılmasını müstəhəb bilmiş (bəyənmiş – Z.Q.), digərləri isə bunu qəbul etməmişlər. Elələri olmuşdur ki, qadına toxunmaqla dəstəmazın pozulması fikrini irəli sürmüş, başqaları isə bunu rədd etmişlər. Bununla yanaşı onlar hamısı eyni bir imamın arxasında namaz qılmış, onlardan heç biri məzhəb ixtilafına görə imam arxasında namaz qılmaqdan boyun qaçırmamışdır.

Təqlidçilərin ixtilafı bunun tam əksinədir. Bunun ən pis nəticələrindən birini iki şəhadətdən sonra islamın ən böyük rüknü olan namazda görmək olar. Təqlidçilər eyni bir imamın arxasında namaz qılmaqdan boyun qaçırıb iddia edirlər ki, imamın namazı onun məzhəbinə müxalif olan

üçün batil və ən azı məkruhdur. Bunu həm eşitmişik, həm də başqaları kimi görmüşük.[13] Hazırda bir çox tanınmış məzhəblərin kitablarında batillik və ikrah təbliğ edilir. Bir məsciddə dörd mehrab görmək olar, bir-birinin ardınca dörd imam orada namaz qılır. Görürsən ki, adamlar öz imamlarını gözlədiyi bir vaxt, başqa bir imam namazla məşğuldur.

Bəzi təqlidçilərdə ixtilaf son həddə çatmışdır. Məsələn, hənəfi məzhəbində olanla şafii məzhəbində olanlar arasında nigah qurmağa maneçilik törədilir. Sonradan hənəfilərin bəzi tanınmış adamları fətva verib Hənəfi kişinin şafii qadınla evlənməsinə icazə verdilər və bu qadını kitab əhli hesab etməklə əsaslandırdılar. Bu, o deməkdir ki, şafii kişi hənəfi qadınla evlənə bilməz. Necə ki, kitab əhli olan qeyri-müsəlman müsəlman qadınla evlənə bilməz!

Əvvəlki dövr elm əhlinin ixtilaflarından fərqli olaraq, sonrakı dövrlərdə yaşayanların ixtilafının nəticəsinin pis təsiri hər bir ağıllı insana bu iki misaldan aydın olur. Onların (xələf-sonrakı dövr alimləri) ixtilafı isə millətdə heç bir pis iz qoymamışdır. Buna görə də sonrakı dövrün alimlərinin

---

[13] "Nədə ixtilaf olmaz" kitabının səkkizinci fəslində bu barədə misallar çoxdur. Onlardan bəziləri bir çox əl-Əzhər alimlərinə məxsusdur.

ixtilafından fərqli olaraq, dində təfriqənin qadağan olmasına aid ayələr onlara aid deyildir.

Allah təala bizim hamımızı düzgün yola yönəltsin!

Kaş ki, onların həmin ixtilafları öz aralarında qalaydı və dəvət ümmətinə sirayət etməyəydi. Onda, bəlkə də, ağrı-acımız azalardı. Lakin, çox təəssüf ki, bu ixtilafların əks-sədası çoxsaylı ölkələrdən gəlir. Məhz bu ixtilaflar onların dəstə-dəstə Allahın dininə daxil olmasına mane olur. Tanınmış alim, professor Məhəmməd Qəzali "Qərbdən düşən kölgə kitabında (səh.200) yazır: "Amerikanın Prinston universitetinin təşkil etdiyi konfransda belə bir hadisə baş verdi. Natiqlərdən biri şərqşünaslar və islamşünaslar arasında geniş yayılmış bir neçə sual verdi: Müsəlmanlar hansı təlimə əsaslanaraq dünyaya üz tuturlar? Qoy onlar başqalarını dəvət etdikləri İslamın nə olduğunu müəyyənləşdirsinlər.

Onlar sünnilərin qəbul etdikləri İslam təlimini, yoxsa imami və ya zeydi şiələrin təlimlərini əsas götürürlər? Bundan əlavə, istər sünnilər, istərsə də şiələr də öz aralarında ixtilafdadırlar...

Onlardan bir dəstə müəyyən bir məsələ barədə məhdud mütərəqqi çərçivə daxilində mühakimə yürütsə də, başqası formal kölə təfəkkür tərzini əsas götürür.

Xülasə, İslama çağıranlar dəvət edilənləri çaş-baş qoyurlar, çünki onların özləri də çaş-baş qalıblar.

Mərhum alim Məhəmməd Sultan əl-Məsumi özünün "Yapon ölkəsi müsəlmanlarına sultanın hədiyyəsi kitabının müqəddiməsində yazır: "Yaponiyanın Tokio və Osaka şəhərlərində yaşayan müsəlmanlar mənə belə bir sualla müraciət etdilər: həqiqi İslam hansıdır? Məzhəb nə deməkdir? İslamı qəbul edən şəxs mütləq bu dörd məzhəbdən birini qəbul etməlidir? Yəni mütləq maliki, hənəfi, şafii və ya qeyrisi olmalıdır, yaxud olmamalıdır?

Burada böyük ixtilaf və ağır münaqişə baş vermişdir. Yapon ziyalılarından bir dəstə açıq fikirli adam İslam dinini qəbul etmək istədi. İman şərəfinə nail olmaq üçün Tokioda yerləşən müsəlman cəmiyyətinə müraciət etdilər. Hindistandan olanlar dedilər: "Siz imam Əbu Hənifənin məzhəbinə daxil olmalısınız. Çünki o, millətin çırağıdır. İndoneziyadan olanlar dedilər: "Siz Şafiinin məzhəbindən olmalısınız!

Bu sözləri eşidən yaponlar çox təəccübləndilər, gəlmələrinə peşman oldular. Beləliklə, məzhəb problemi onların müsəlmanlığı yolunda əngələ çevrildi.

3- Əks mövqedə duranlar özlərini Sünnə tərəfdarı kimi göstərib imamların fikirlərini qəbul etməməyə, onların iddialarını birdəfəlik və tamamilə rədd etməyə çağırırlar. Buna cavab olaraq deyirəm: bu iddia həqiqətdən çox-çox uzaqdır, onun tam batilliyi göz qabağındadır. Yuxarıda dediklərimizdən aydın olduğu kimi, bu da səhv mövqedir. Biz yalnız məzhəblərin din kimi qəbul edilməsini, Kitab və Sünnənin onlarla əvəz edilməsinin əleyhinə olmuşuq. Halbuki indiki dövrdə fiqh alimləri bir çox mübahisəli məsələlərdə yeni hökmlər çıxartmaq istədikdə bu məzhəblərə müraciət edirlər. Onlar həmçinin məişət, nigah, talaq və s. məsələlərdə də haqqı nahaqdan seçmək üçün Kitab və Sünnəyə əsaslanmadan yeni hökmlər verir, düzü əyriyə qatırlar. Budur onların getdikləri "ixtilafları mərhəmətdir yolu! Asanlıqla keçilən şəxsi mənafe naminə uğurlar gətirən bir yol.

Mərhum Süleyman ət-Təmimi bu adamlar barədə demişdir: "Bütün alimlərin rüxsətlərini götürsən, onda bil ki, bütün şərlər səndən yayılıbdır. İbn Abdul-Bərr bu fikri belə

şərh edir: “Bu elə bir yekdil fikirdir ki, onda ixtilaf bilmirəm. *(2/91/92)*

Biz bax bunu inkar edirik. Bu da yuxarıda göründüyü kimi yekdil fikrə müvafiqdir.

Kitab və Sünnədə açıqca zikr olunmayan bəzi məsələlərdə, onların ixtilaf etdikləri məsələlərdə dedikləri sözlərə müraciət etməyi, onlardan haqqı başa düşmək üçün istifadə etmək və ya köməkçi vasitə kimi istifadə etməyi inkar etmirik, əksinə biz buna çağırır və səsləyirik. Çünki bunda fayda vardır.

Görkəmli alim İbn Abdul-Bərr *–rahmətullahi aleyh-* demişdir: “Qardaşım! Sən İslamın əsaslarına sədaqətli olmalısan. Bil ki, sünnələrə və Quranın əhatə etdiyi prinsiplərə sadiq olub fəqihlərin fikirlərini nəzərdən keçirən şəxs onlardan öz biliyini dərinləşdirmək üçün köməkçi vasitə, nəzəri problemləri başa düşmək üçün açar, mənalarının şərhi kimi istifadə edirlər. Bu alimlərdən heç biri təqlid edilməməlidir. Yalnız sünnələrin göstərişlərini rəhbər tutmalıdır və onlara heç bir şəkk-şübhə ola bilməz. Sadiq tədqiqatçı alimlər sünnələrdən əxz etdiklərini öyrənməklə kifayətlənməyib bundan yalnız tədqiqat,

anlamaq və axtarış vasitəsi kimi istifadə edirlər. Bu alimlərə çəkdikləri zəhmətə görə və qoyub getdikləri irsə görə təşəkkürümüzü bildiririk. Onların dediklərinin əksəriyyətini təşkil edən həqiqətə görə sağ olsunlar. Bu heç də onları yol verdikləri təhrif və zəlalətdən (haqq yolunu azmaqdan – Z.Q.) xilas etmir necə ki, onlar özləri də bunu etiraf edirlər. Əməlisaleh sələflərimiz özlərinə belə tələbkarlıqla yanaşmışlar. Bu yol öz məzmununa, mənasına, doğruluğuna görə Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* Sünnəsinə və Onun əshabələrinin *–radıyallahu anhum-* yoluna uyğun olan haqq yoludur.

Özünü tədqiqat, axtarış və yuxarıda qeyd etdiyimiz başqa işlərdən azad bilib irəli sürdüyü fikirləri ilə Sünnəyə qarşı çıxan və onu öz rəyinə uyğunlaşdırmaq istəyən şəxs haqq yolunu azmış olur. Bütün bunlar həm də cəhalət və nadanlıqdır ki, özünü heç bir elmi əsas olmadan verilən fətvalarda göstərir. Bu kor olmaq, yol azmaq deməkdir.

Bu yolun haqq yolu olduğu sirr deyil, məni bu yolun yolçusu et, ya Rəbb!

4- Bəzi təqlidçilərdə məzhəblərin özlərinə də zidd olan və onları Sünnədən ayıran belə bir səhv fikir

formalaşmışdır ki, məzhəb sahibinin səhvlərini açıb göstərməməlidirlər. Səhvləri açıb göstərmək isə imama hörmətsizlikdir. Hər hansı bir müsəlmana qarşı hörmətsizliyə yol vermək olmaz. Xüsusilə imamlardan hər hansı biri haqqında hörmətsizlik qətiyyən yol verilməzdir.

Buna cavab olaraq deməliyik: bu, səhv fikirdir, Sünnə fiqhinə qarşı çıxmaqdır. Yoxsa, aqil müsəlman bunu necə deyə bilər? Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Əgər hakim doğru hökm verirsə iki, səhv hökm verirsə, yalnız bir əcr qazanmış olur"* (əl-Buxari və Müslim).

Bu hədis yuxarıda qeyd edilən fikrin səhv olduğunu göstərir və belə bir qənaətə gəlmək üçün şübhə yeri qoymur ki, "filankəs səhv etdi ifadəsinin şəriət mənası "filankəs yalnız bir əcr qazandı deməkdir. Əgər insan səhvi göstərməklə əcr sahibi olursa, onda bunu necə kiməsə qarşı hörmətsizlik kimi qəbul etmək olar? Heç şübhəsiz, bu, səhv fikirdir və ondan əl çəkmək lazımdır. Əslində bu fikir sahibinin özü müsəlmanlara, hətta adi müsəlmanlara qarşı deyil, ən böyük imamlara – əshabələrə, ardıcıllara, onlardan sonra isə tanınmış alimlərə qarşı hörmətsizlik edir, onları bir-birinə qarşı qoyur.

Aqil adam bu barədə deyər: doğrudur, onlar bir-birini tənqid etmişlər. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Əbu Bəkrin *–radıyallahu anhu-* bir kişinin yuxusunu yozması barədə demişdir: "Bəzi sözlərində haqlısan, bəzilərində isə səhv edirsən. Məgər bununla Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Əbu Bəkrə qarşı hörmətsizlik etmişdir?! Bu səhvin ona yol verənlərə təsiri çox qəribədir. Bu səhv fikir öz sahiblərinin rəyinə görə, Sünnəyə əməl etmək imama hörmətsizlik deməkdir. Lakin, imama sədaqət – Sünnəyə müxalif olsa belə – ona ehtiram və iltizam deməkdir. Buna görə də onlar (iddia etdikləri) yalançı hörmətsizlikdən qaçaraq imamı təqlid etməkdə israr edirlər.

Lakin onlar bu fikirlə özləri də bilmədən qaçmaq istədikləri şərə qurşanmış olduqlarını unudurlar. Mən demirəm ki, qəsdən buna yol verirlər. Onlara deyə bilərlər ki, əgər birinin ardıcılı olmaq ona ehtiram, ona qarşı çıxmaq isə hörmətsizlikdirsə, onda Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* Sünnəsinə müxalif olmağı necə rəva bilirsiniz, onun əksinə olaraq məzhəb imamına sadiq olursunuz? Bəlkə, Sünnə qeyri-məsumdur, ona hörmətsizlik küfr deyil?! Sizin fikrinizcə, imama müxalifət onun haqqında hörmətsizlikdir. Amma Peyğəmbərə *-səlləllahu aleyhi və*

*alihi və səlləm-* müxalifət öz mahiyyəti etibarı ilə ona hörmətsizlikdir, bu isə eyni ilə küfrdür (Allah qorusun!). Onlara belə bir şey deyilsə, heç şübhəsiz, cavab tapa bilməzlər. İlahi! Cavab tapa bilmədikdə bəzilərindən eşitdiyimiz o kəlməyə qayıdırlar: bizim Sünnədən uzaq olmağımız öz məzhəbimizin imamına sədaqət deməkdir. Çünki imam Sünnəni bizdən yaxşı bilir.

Bu iddiaya cavab verməklə müqəddiməni uzatmış olarıq. Buna görə də mən yalnız müxtəsər bir cavabla kifayətlənirəm və Allah təalanın izni ilə bu cavab qəti olacaqdır:

Sünnəni təkcə sizin imamınız daha çox bilmir. Yüzlərlə imam var ki, onlar da Sünnəni sizdən daha çox bilirlər. Sizin məzhəbinizə müxalif olan və eyni zamanda həmin imamlardan birinin də əməl etdiyi səhih Sünnəyə siz də mültəzim olmalısınız. Sizin yuxarıda qeyd edilən iddianızın burada xeyri yoxdur. Müxalifiniz sizə qarşı çıxıb deyəcək: əgər biz imamın da qəbul etdiyi Sünnəyə əməl ediriksə, onda Sünnəyə bağlılıq ona müxalif olan imama bağlılıqdan irəlidir. Bu isə aydın həqiqət olub heç kəs də şübhə doğurmamalıdır.

Son olaraq deyə bilərəm:

Bizim bu kitabımızda Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* namazı necə qıldığı barədə qayda-qanunları toplanmışdır. Onlara əməl etmək hər kəs üçün vacibdir. Alimlər onlara əməl etmək zərurəti məsələsində yekdil olub bunu etməməkdən insanları çəkindirmişlər. Bu kitabda elə bir problem yoxdur ki, o haqda bəzi imamların fikri olmasın. Bu məsələlərə toxunmayan alimlər isə üzürlüdür, yalnız bir əcrə layiqdirlər. Çünki onlara bu məsələlərdə Kitab və Sünnədən dəlil çatmamış və ya onların fikrinə görə dəlil bu məsələ üçün yararlı olmamışdır. Bütün bu alimlər üzürlüdürlər. Alimlərdən qalan mətnləri təqlid edənə isə üzür ola bilməz. Bu halda mövcud səhih dəlilə əməl etmək vacibdir. Müqəddimənin də məqsədi budur. Qüdrət və Cəlalət sahibi Allah təala buyurur: **«Ey iman gətirənlər! Sizə həyat verəcək şeyə sizi çağıran Allaha və Peyğəmbərə razılıq cavabı verin. Bilin ki, Allah insanla onun qəlbi arasına girər və siz axırda Onun hüzuruna cəm ediləcəksiniz!»** *(əl-Ənfal, 24)*.

Allah kəlamı haqdır. O, haqq yolunu göstərir. O, ən böyük nemətlərin sahibi, ən böyük qələbələri qazandırandır.

Aləmlərin Rəbbinə həmd olsun! Məhəmmədə, onun ailəsinə və əshabələrinə salavat və salam olsun!

*Məhəmməd Nasir əd-Din əl-Əlbani*
*Dəməşq,*
*20.05.1351 h.*



## KƏBƏYƏ DOĞRU YÖNƏLMƏK

**P**eyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* fərz və nafilə namazlarını qılanda üzünü Kəbəyə tutardı. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazını düzgün qılmayana əmr edərək demişdir: "*Əgər namaza dursan, əvvəlcə dəstamaz al, sonra qibləyə tərəf üz çevirib təkbir elə* (əl-Buxari, Müslim, əs-Sərrac).

Səfər zamanı Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* nafilə namazlarını öz dəvəsinin belində, şərq və qərb istiqamətində vitri qılardı.

Bu barədə Allah təalanın bu kəlamı nazil olmuşdu: **«...hansı tərəfə yönəlsəniz (*üz tutsanız*) Allah oradadır»** *(əl-Bəqərə, 115)* (Müslim və ət-Tirmizi. Səhih hədis).

"*Bəzən öz dəvəsinin belində namaz qılmaq istəsəydi, dəvəni qibləyə yönəldib təkbir edərdi. Sonra dəvəsinin yönəldiyi istiqamətdə namazını qılardı"* (Əbu Davud, İbn Hibban, İbn əs-Səkən, İbn əl-Muləkkin və s. Səhih və etibarlı hədisdir).

"*Öz dəvəsinin belində başının işarəsi ilə rüku və səcdə edərdi, səcdəni rükuda etdiyindən başını daha çox aşağı*

*əyməklə yerinə yetirərdi”* (Əhməd və ət-Tirmizi. Səhih hədis).

“*O fərz namazını minikdən düşüb qibləyə duraraq qılardı”* (əl-Buxari və Əhməd).

Şiddətli qorxu namazına aid Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* öz ümməti üçün aşağıdakı qaydanı müəyyənləşdirmişdir: “*Piyadalar qiyamı yerinə yetirməklə (ayaq üstə durmaqla) və ya minik belində olmaqla, qibləyə durmaqla və ya durmamaqla namaz qıla bilərlər”* (əl-Buxari və Müslim).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurur: “*Əgər bir-birilə qarışsalar, yəni şiddətli döyüş vaxtı təkbir və baş ilə işarə etməklə namaz qılmaq olar”* (əl-Beyhəqi).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyururdu: “*Məşriqlə məğrib arası qiblədir* (ət-Tirmizi və əl-Hakim. Səhih hədisdir).

Cabir *–radıyallahu anhu-* demişdir: “*Rəsulullahla -səlləllahu aleyhi və alihi və səlləm- yürüşə çıxmışdıq. Birdən ətrafı duman bürüdü. Çox çalışdıq, amma qibləni dəqiq müəyyənləşdirə bilmədik. Hər kəs ayrıca namaz qılmalı oldu.*

*Bizdən biri olduğumuz yeri və namaz qıldıqda üz tutduğumuz istiqaməti nişanladı. Duman çəkiləndə baxıb gördük ki, qibləyə üz tutmamışıq. Bu barədə Peyğəmbərə -səlləllahu aleyhi və alihi və səlləm- məlumat verdikdə o bizə yenidən namaz qılmağı tapşırmayıb dedi: "Sizin namazınız qəbul olundu"* (əd-Dəraqutni, əl-Hakim, əl-Beyhəqi, ət-Tirmizi, İbn Macə və ət-Təbərani).

*"Aşağıdakı ayə nazil olmamışdan əvvəl Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- Kəbə qarşısında ola-ola, Beytül-Müqəddəsə üz tutaraq namaz qılardı:* **«Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama tərəf çevir!»** (əl-Bəqərə, 144). *Bu ayədən sonra Kəbə qiblə seçildi. Belə ki, hamı sübh namazına durmuşdu. Onlara belə bir xəbər çatdı: "Rəsulullaha -səlləllahu aleyhi və alihi və səlləm- bu gecə Quran (*ayə – Z.Q.*) nazil olmuşdur və Kəbənin qiblə seçilməsi əmr edilmişdir. Namaza duranların üzü Şama tərəf idi və bu xəbərdən sonra çevrildilər" (Yəni onların imamı üzünü çevirib qibləyə durdu)* (əl-Buxari, Müslim, Əhməd və əs-Sərrac).

## QİYAM VƏ XƏSTƏNİN NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Allah təalanın **«...Allaha itaət üçün ayağa qalxın»** *(əl-Bəqərə, 238)* ayəsində buyurduğunu yerinə yetirərək fərz və könüllü namazlar zamanı ayaq üstə durardı.

Səfər edərkən öz dəvəsinin belində namaz qılardı.

Yuxarıda deyildiyi kimi, şiddətli qorxu vaxtı öz ümmətinə ayaq üstə duraraq və ya minik belində ikən namaz qılmağı icazə vermişdir: **«Namazlara və (*xüsusilə*) orta namaza[14] əməl edin və Allaha itaət üçün ayağa qalxın. Əgər (*düşməndən və ya yırtıcı heyvandan*) qorxsanız, piyada gedə-gedə və ya minik üstə (*qılın*). (*Təhlükədən sovuşmağınıza*) əmin olduqda isə Allahı, bilmədiyiniz şeyləri sizə (*Peyğəmbər*) necə öyrədibsə, o cür anın (*zikr edin, namaz qılın*)»** *(əl-Bəqərə, 238-239)*

*"Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- ölüm ayağında xəstə ikən oturaraq namaz qılardı* (ət-Tirmizi və Əhməd. Səhih hədisdir).

[14] Alimlərin əksəriyyətinin fikrincə bu əsr (ikindi) namazıdır. Bunu sübut edən hədislər də çoxdur. Onları İbn Kəsir öz "Təfsir" əsərində vermişdir.

*“Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- başqa bir vaxt da bu cür namaz qılmışdı. Bir dəfə camaat onun arxasında ayaq üstə namaz qıldığı vaxt onlara oturmağı işarə etdi və hamı oturdu. Namaz qurtardıqdan sonra dedi: “Siz az qala farslar və rumların öz şahları ilə etdiyi hərəkətə yol verəsiniz. Şahları oturduğu halda onlar ayaq üstə durardılar. Siz belə etməyin. Siz imamın etdiklərini edin, o, rüku etsə, siz də edin, qalxsa, siz də qalxın, namazda otursa, siz də hamılıqla oturun* (əl-Buxari və Müslim).

Xəstənin oturaraq namaz qılması barədə İmran bin Husayyin *–radıyallahu anhu-* demişdir: “*Mən babasil xəstəliyinə tutulmuşdum. Bu vəziyyətdə namaz qılmaq barədə Peyğəmbərdən -səlləllahu aleyhi və alihi və səlləm- soruşdum. O mənə dedi: “Ayaq üstə namaz qıl, bacarmasan, oturaq qıl, bunu da edə bilməsən, uzanıb qıl”* (əl-Buxari, Əbu Davud, Əhməd).

O, həmçinin demişdir: “*Mən Peyğəmbərdən -səlləllahu aleyhi və alihi və səlləm- oturaq namaz qılan adam barədə soruşanda, o dedi: “Ayaq üstə namaz qılan ən çox əcr qazanmış olur, oturaq namaz qılan bunun yarısını qazanır, uzanıb namaz qılan isə oturaq namaz qılanın əcrinin yarısını*

*qazanır* (əl-Buxari, Əbu Davud və Əhməd).[15] Burada xəstələrin qıldığı namaz nəzərdə tutulur.

Ənəs *–radıyallahu anhu-* demişdir: "*Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- adamların arasına gələndə onlar xəstə olduqları üçün oturaq namaz qılırdılar. O dedi: "Oturanın namazının əcri ayaq üstə qılınan namazın əcrinin yarısı qədərdir"* (Əhməd və İbn Macə. Səhih hədisdir).

*"Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bir xəstənin balış üstə namaz qıldığını gördü. O balışı götürüb kənara atdı. Xəstə bir əsa götürdü və namaza başladı. Onu da alıb kənara tullayaraq dedi: "Bacarsan, yerə uzanıb namaz qıl, bacarmasan, (başınla) işarə et. Səcdəni rükuya nisbətən daha aşağı et"* (ət-Təbərani, əl-Bəzzar, İbn əs-Səmmak və əl-Beyhəqi. Səhih hədis).

---

[15] İmranın hədisində güclə ayaq üstə duran və çox çətinliklə namaz qıla bilən xəstələr nəzərdə tutulur. Buna görə də bu xəstələrin oturaraq qıldıqları namazın əcri ayaq üstə qılınanın əcrinin yarısına bərabər tutulur. Çünki bu xəstə ağır da olsa ayaq üstə durub namaz qıla bilər, həm də onun oturaraq namaz qılmaq icazəsi vardır.

## GƏMİDƏ NAMAZ QILMAQ

Peyğəmbərdən *-səlləllahu aleyhi və alihi və səlləm-* gəmidə namaz barədə soruşulduqda o demişdir: "*Əgər batmaqdan qorxmasan, ayaq üstə namaz qılmalısan*"[16] (əl-Bəzzar, əd-Dəraqutni və Abdul Ğəni əl-Məqdisi. Səhih hədisdir).

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- qocalıb yaşa dolanda namaz vaxtı əsa götürüb ona söykənərmiş* (Əbu Davud, əl-Hakim).

## GECƏ NAMAZINDA DURMAQ VƏ OTURMAQ

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- gecə vaxtı uzun müddət həm ayaq üstə, həm də oturaraq namaz qılardı. Əgər ayaq üstə qiraət etsəydi, rükunu da ayaq üstə*

---

[16] Təyyarədə də gəmidə olduğu kimi namaz qılırlar. Əgər bacarırsa ayaq üstə dura bilər. Mümkün olmasa oturaraq rüku və səcdəni başın işarəsi ilə edə bilər.

*edərdi. Oturaraq qiraət etsəydi, rükunu da oturaraq icra edərdi* (Müslim və Əbu Davud).

“*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bəzən oturaq namaz qılar, oturaq vəziyyətdə qiraət edərdi. Qiraətindən otuz və ya qırx ayə qalanda, ayaq üstə durub onların qiraətini başa çatdırardı. Bundan sonra rüku və səcdə edərdi. İkinci rükətdə də eyni cür hərəkət edərdi”* (əl-Buxari və Müslim).

“*Yaşa dolduqda, həyatının son illərində, vəfatına bir il qalmış Sübhə (yəni nafilə, sünnə) namazını oturaraq qılardı”* (Müslim və Əhməd).

“*Bardaş qurub oturardı”* (ən-Nəsai, İbn Xuzeymə, Abdul Ğəni əl-Məqdisi və əl-Hakim. Səhih hədisdir).

## AYAQQABIDA NAMAZ BARƏDƏ GÖSTƏRİŞ

“*Bəzən ayaqyalın, bəzən də ayaqqabısını çıxartmadan (namaza) durardı”* (Əbu Davud və İbn Macə).

Bunu öz ümmətinə icazə verərək demişdir: “*Sizdən biriniz namaz qılarkən istərsə ayaqqabıda, istərsə də*

*ayaqqabını çıxarıb onu ayaqları arasında qoymaqla - başqalarına əziyyət verməməsi üçün – qılsın”* (Əbu Davud, əl-Bəzzar və əl-Hakim. Səhih hədisdir).

Bəzən də ayaqqabıda namaz qılmağa təkid edərək deyərdi: “*Yəhudilər kimi olmayın. Onlar ayaqqabılı namaz qılmırlar. Onların əksinə olaraq ayaqqabıda namaz qılın!”* (Əbu Davud, əl-Bəzzar və əl-Hakim. Səhih hədisdir).

Hərdən namaza başlayanda ayaqqabılarını çıxarırmış və sonra namazı davam etdirirmiş.

Əbu Səid əl-Xudri demişdir: “*Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- bizimlə birgə bir gün namaz qılırdı. Bir qədər namaz qılmışdı ki, ayaqqabılarını çıxarıb sol tərəfinə qoydu. Bunu görənlər onun etdiyi kimi etdilər. Namaz bitdikdən sonra dedi: “Nə oldu ki, siz də ayaqqabılarınızı çıxartdınız?” Camaat dedi: “Gördük ki, sən ayaqqabılarını çıxartdın, biz də ayaqqabılarımızı çıxartdıq”. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- buyurdu: “Cəbrayıl gəlib xəbər verdi ki, ayaqqabılarımda nəcis (*başqa rəvayətdə deyilir: *zibil) vardır. Mən də onları çıxardım. Sizdən biriniz məscidə gələndə görsə ki, ayaqqabıları nəcislidir (zibillidir), onları silməli və onlarla namaz*

*qılmalıdır"* (Əbu Davud, İbn Xuzeymə, əl-Hakim, əz-Zəhəbi və ən-Nəvəvi. Səhih hədisdir).

"*Ayaqqabılarını çıxaranda sol tərəfinə qoyardı"* (Əbu Davud, ən-Nəsai və İbn Xuzeymə) və deyərdi: "*Sizdən biri namaz vaxtı ayaqqabılarını çıxarsa, onları sağ tərəfdə qoymamalıdır. Sağda namaz qılan ola bilər. Əgər sol tərəfdə də namaz qılan olarsa, ayaqqabıları ayaqları arasına qoymalıdır"* (Əbu Davud, ən-Nəsai və İbn Xuzeymə. Səhih hədisdir).

## MİNBƏRDƏ NAMAZ QILMAQ

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bir dəfə minbərdə namaz qıldı"*.[17] Bir rəvayətdə deyilir ki: "M*inbər üç pilləli idi. Minbərdə ayaq üstə durdu, təkbir etdi. Camaat da onun ardınca, o minbərdə ola-ola təkbir etdilər. Sonra o, minbərdə rüku etdi. Bundan sonra addım-addım geriyə gedərək minbərin təməlində səcdə etdi və yenidən minbərə qayıtdı. Bunu sonrakı rükətlərdə də təkrar etdi.*

[17] Sünnəyə görə minbərin üç pilləsi olmalıdır, bu sayın artırılması əməvi bidətidir.

*Namazını bitirdikdən sonra adamlara üz tutub dedi: "Camaat, bunu etdim ki, məndən nümunə götürəsiniz və necə namaz qıldığımı öyrənəsiniz* (əl-Buxari, Müslim və İbn Səd).

## SÜTRƏ VƏ ONUN VACİBLİYİ

***P****eyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- sütrəyə yaxın durardı. Onunla divar arasında üç qulac məsafə olardı* (əl-Buxari və Əhməd).

"*Onun səcdə yeri ilə divar arasından bir quzu keçə bilərdi* (əl-Buxari və Müslim).

O deyərdi: "*Yalnız sütrə ilə namaz qılın. Kimisə qabağınızdan keçməyə qoymayın. Əgər dayanmasa, onunla vuruşun. Çünki onunla şeytan vardır"* (İbn Xuzeymə. Etibarlı hədis).

O həmçinin buyurur: "*Biriniz sütrə ilə namaz qıldıqda ona yaxın dursun ki, şeytan onun namazını kəsə bilməsin"* (Əbu Davud, əl-Bəzzar və əl-Hakim. Səhih hədisdir).

“*O, bəzən məscidin sütunu yanında namaz qılardı.*”[18]

“*Açıq havada sütrə kimi götürüləsi bir şeyin olmadığı yerdə namaz qılanda qabağına süngü sancardı və adamlar da arxasında durardı”* (əl-Buxari, Müslim və İbn Macə).

“*Bəzən də öz dəvəsini sütrə kimi qoyub namaz qılardı”* (əl-Buxari və Əhməd).

“*Bu, dəvə saxlanılan yerdə namaz qılmaqdan fərqlənir. Çünki bunu qadağan etmişdir”* (əl-Buxari və Əhməd).

*“O, “bunu qadağan etmişdi”. Bəzən də “palanı qoyardı” və ondan sütrə kimi istifadə edib namaz qılardı”* (Müslim, İbn Xuzeymə və Əhməd).

---

[18] Mən deyirəm: Sütrə istər ayrılıqda, istərsə də böyük məsciddə namaz qılan imam üçün də vacibdir. İbn Hani yazır: "Əbu Abdullah (yəni imam Əhməd) bir gün mənim sütrəsiz namaz qıldığımı görür. Biz böyük məsciddə idik. İmam mənə dedi: "Bir şeyi özünə sütrə seç". Mən də bir kişini sütrə seçdim".

Mən deyirəm: "Bununla imam deyir ki, istər böyük, istərsə də kiçik məsciddə sütrə mütləq olmalıdır. Mənim gəzmiş olduğum ölkələrdə imamlar bu qaydanı pozurlar. O cümlədən, mən ilk dəfə 1401-ci ilin Rəcəb ayında Səudiyyədə olanda bunun şahidi olmuşam. Alimlər camaata sütrə seçməyin zərurətini izah etməli, buna sövq etməlidirlər. Bu həmçinin hər iki müşərrəf hərama da aiddir (yəni Kəbəyə və Mədinə məscidlərinə - Z.Q.).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurmuşdur: "*Dəvənin arxasında qoyulan çubuğu sütrə kimi qabağa qoymaq olar. Onun arxasından kiminsə keçməsinin əhəmiyyəti yoxdur"* (Müslim və Əbu Davud).

"*O, bir dəfə qabağında ağac namaz qıldı* (ən-Nəsai və Əhməd. Səhih hədisdir).

"*Bəzən qabağında çarpayı namaz qılardı. Bu vaxt Aişə –radıyallahə anhə- yorğanın altında çarpayıda uzanardı"* (əl-Buxari, Müslim və Əbu Yəla).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* onunla sütrə arasından heç nəyi keçməyə qoymazdı. "*Bir dəfə namaz vaxtı bir quzu onun qabağından keçmək istədi. Onu qabaqlayaraq az qala qarnını divara yaxınlaşdırmışdı, quzu qayıdıb arxadan keçdi"* (İbn Xuzeymə, ət-Təbərani və əz-Zəhəbi. Səhih hədisdir).

"*Bir dəfə vacib namaz vaxtı əllərini uzadıb bir-birinə sıxdı. Namazdan sonra soruşdular: "Ya Rəsulullah! Namaza təzə bir şey əlavə edilir?" O dedi: "Yox. Şeytan istədi ki, qabağımdan keçsin. Onu boğurdum, hətta dilinin soyuqluğunu əlimdə hiss etdim. Allaha and olsun! Əgər qardaşım Süleyman olmasaydı, onu məscidin sütunlarından*

*birinə bağlayardım ki, Mədinə uşaqları gəlib onunla əylənsinlər. Kim istəyirsə onunla qiblə arasına bir şey girməsin, belə etməlidir".*[19] *Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- demişdir: "Sizdən biri onu insanlardan ayıran sütrəyə namaz qılanda kimsə qabağından cəhd eləsə, onu döşündən itələməlidir. Əgər geri dönməsə, onunla vuruşmalıdır. Çünki bu, şeytan ola bilər"* (əl-Buxari, Müslim və İbn Xuzeymə).

O həm də demişdir: "*Əgər namaz qılanın qarşısından keçən bilsə ki, necə günaha batır, qırx (il) dayanaraq gözləməsi oradan keçməsindən daha xeyrli olardı"* (əl-Buxari, Müslim və İbn Xuzeymə).

---

[19] Bu hədis barədə Qədyaniyyə tayfası küfrə yol verir. Onlar Quranda və Sünnədə adı çəkilən cin aləminə inanmırlar. Onlar Quranı təhrif edirlər. Məsələn, onlar **«De: "Mənə vəhy olundu ki, bir dəstə cin dedilər: "Biz çox qəribə bir Quran eşitdik»** ayəsini şərh edərkən "cinlər" sözünü "insanlar" sözü ilə əvəz edirlər. Bununla onlar həm dil, həm şəriət, həm də Sünnə baxımından təhrifə yol verirlər. Onlar batil şəriətə, həm də Sünnə baxımından təhrifə yol verirlər. Əgər bütün alimlər birləşib bu təhrifi aradan qaldırsalar, Allah da onları haqq yoluna yönəldər.

## NAMAZI POZAN AMİLLƏR

Hədisdə deyilir: "*Qabağında palan (yəni sütrə) olmayan şəxsin namazını həddi-büluğa çatmış qız, ulağ və qara it poza bilər".*[20] Əbu Zər demişdir: "*Soruşdum ki, ya Rəsulullah, qara (itlə) qırmızının nə fərqi vardır? O dedi: "Qara it şeytandır"* (Müslim, Əbu Davud, İbn Xuzeymə).

## QƏBRƏ ÜZ TUTUB NAMAZ QILMAQ BARƏDƏ

Peyğəmbər -*səlləllahu aleyhi və alihi və sələm*- qəbrə üz tutub namaz qılmağı qadağan edərək demişdir: "*Qəbirlərə üz tutub namaz qılmayın və onların üstündə oturmayın"* (Müslim, Əbu Davud, İbn Xuzeymə).

## NİYYƏT [21]

---

[20] Burada kəsmək (pozmaq) dedikdə namazın batil edilməsi nəzərdə tutulur. "Namazı heç nə kəsə bilməz" hədisi isə zəifdir.

[21] Niyyət məqsəddir. Namaz qılan dilə gətirmədən öz fikrində namazın mahiyyətini hazırlayır, hansı növ namazı qılacağını müəyyənləşdirir. Məsələn: zöhr, fəcr və i.a.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Əməllər niyyətlərə görədir. Hər kəsə öz niyyətinə görə (mükafat və ya savab) veriləcək"* (əl-Buxari, Müslim və b.).

## TƏKBİR

Niyyətdən sonra Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazı "Allahu əkbər (Allah böyükdür) ifadəsi ilə açardı.[22] Bunu yuxarıda qeyd etdiyimiz kimi, "namazını düzgün qılmayana əmr edərək demişdir: "*Əvvəlcə dəstamaz alıb, bütün dəstamaz yerlərini pak etməyənin və bundan sonra isə "Allahu əkbər" deməyənin namazı tamamlanmır"* (ət-Təbərani. Səhih hədisdir).

---

[22] Bu hədisdən görünür ki, Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazı açarkən "niyyət etdim ki, namazı qılım" ifadəsini işlətməmişdir. Belə demək əslində bidətdir. Bəziləri bunun yaxşı və pis olması barədə mübahisə edirlər. Biz isə deyirik: "İbadətdə hər bir bidət haqq yolunu azmaqdır (zəlalətdir). Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurur: *"Hər bir bidət haqq yolunu azmaqdır, haqq yolunu azmaq isə odla cəzalanır"*.

O həmçinin demişdir: “*Namazın açarı dəstamazdır. “Allahu əkbər” (“təkbir”) namaza daxil olması, namazdan başqa bütün əməllərdən uzaqlığı, “salam” isə onun salam verib namazdan çıxması (“təslim”) deməkdir”*[23] (Əbu Davud, ət-Tirmizi, əz-Zəhəbi. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurur: “*Əgər imam “Allahu əkbər” desə, siz də deyin: “Allahu əkbər”* (Əhməd və əl-Beyhəqi. Səhih hədisdir).

*“Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- təkbir vaxtı səsini qaldırardı ki, arxadakılar onu eşitsinlər”* (*Əhməd, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir*).

*“O xəstələndikdə Əbu Bəkr səsini qaldırardı ki, Peyğəmbərin -səlləllahu aleyhi və alihi və səlləm- təkbirini eşitsinlər”* (Müslim və ən-Nəsai).

## ƏLLƏRİN YUXARI QALDIRILMASI

[23] Təhrim - Allahın namaz daxilində yasaq etdikləridir. Təhlil isə Onun sonra icazə verdiyi əməllərdir. Təhrim və təhlil dedikdə haram və halal nəzərdə tutulur. Hədisdən göründüyü kimi, namazın qapısı bağlıdır. Bəndə onu yalnız təharət (təmizlik, dəstəmaz) ilə aça bilər. Namaz yasağına (qoruğuna) yalnız təkbir ilə daxil olmaq mümkündür. Oradan çıxmaq isə yalnız təslimlə mümkündür. Bu əksər alimlərin fikridir.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sələm-* "*bəzən təkbir əsnasında, bəzən ondan sonra, bəzən isə əvvəl əllərini yuxarı qaldırardı* (əl-Buxari, ən-Nəsai və Əbu Davud).

"*O, əllərini barmaqları yuxarı yönəlmiş vəziyyətdə qaldırardı. Onları aralamazdı və bükməzdi"* (Əbu Davud, İbn Xuzeymə, əl-Hakim, əz-Zəhəbi. Səhih hədisdir).

"*O, əllərini çiyinlərinin qarşısına qədər qaldırardı. Hərdən qulaqları qarşısına qədər qaldırardı"* (əl-Buxari, Əbu Davud).

## SAĞ ƏLİN SOL ƏL ÜSTƏ QOYULMASININ ƏMR EDİLMƏSİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazda sağ əlini sol əli üstünə qoyardı. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* deyərdi: "*Biz peyğəmbərlərə iftarımızı tezləşdirməyi, səhurumuzu (və ya sühurumuzu) gecikdirməyi, namaz vaxtı sağ əli sol əlin*

*üstünə qoymağı əmr olunmuşdur"* (Müslim, Əbu Davud, İbn Hibban və əz-Ziya. Səhih hədisdir).

"*O, yoldan keçəndə bir kişinin sol əlini sağ əlinin üstünə qoyub namaz qıldığını görür. Onun əllərini aralayıb sağ əlini sol əlinin üstünə qoyur"* (Əhməd və Əbu Davud. Səhih hədisdir).

## ƏLLƏRİN SİNƏYƏ QOYULMASI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* "*sağ əlini sol əlinin biləyinin və said sümüyünün üstünə qoyardı"* (Əbu Davud, ən-Nəsai və İbn Xuzeymə. Səhih hədisdir).

"*O belə etməyi əshabələrə də əmr etmişdi"* (Malik, əl-Buxari və Əbu Uvanə).

"*Bəzən o, sağ əli ilə sol əlin (biləyin)-dən yapışardı"* (ən-Nəsai və əd-Dəraqutni. Səhih hədisdir).

"*O, əllərini sinəsinə qoyardı*[24] (Əbu Davud və İbn Xuzeymə. Səhih hədisdir).

---

[24] Namazda əllərin sinəyə qoyulması Sünnə ilə sübut edilir. Bunun əksini göstərən hədislər zəifdir və heç bir əsası yoxdur.

“*Əllərini çarpazlamağı yasaq edərdi* (Əbu Davud və ən-Nəsai).

## SƏCDƏ YERİNƏ BAXMAQ VƏ İTAƏT

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “*namaz qılanda başını aşağı salardı və nəzərlərini yerə dikərdi və Kəbəyə girəndən çıxana kimi nəzərlərini səcdə yerindən ayırmazdı”*[25] (əl-Beyhəqi, əl-Hakim və İbn Asəkir. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Evdə namaz qılanın fikrini yayındıra biləcək heç nə olmamalıdır”* (Əbu Davud və Əhməd. Səhih hədisdir).

“*O namaz vaxtı nəzərlərini göyə dikməyi qadağan edirdi”* (əl-Buxari və Əbu Davud).

Bu qadağanı təkidlə deyərdi: *“Namazda səmaya baxan qövmlər həlak ola bilərlər ya da kor olarlar. Adamlar*

[25] Bu hədislərdən göründüyü kimi, namaz qılan nəzərlərini yerdə səcdə nöqtəsinə dikməlidir. Bəzi namaz qılanlar gözlərini yumurlar. Bu doğru deyildir. Ən doğru yol Məhəmmədin yoludur.

*namaz vaxtı nəzərlərini göyə çevirməməli, gözlərini yummamalıdır”* (əl-Buxari, Müslim və əs-Sərrac).

Başqa bir hədisdə deyilir: “*Namaz qılanda kənara baxmayın. Allah təala, namaz vaxtı ətrafa baxmayana qədər ibadət edənin düz üzünə baxır”* (ət-Tirmizi və əl-Hakim. Səhih hədisdir). Bu barədə başqa hədisdə deyilir: “*Bununlada şeytan bəndənin namazından (savabından) oğurlayır* (əl-Buxari və Əbu Davud).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Allah namaz vaxtı bəndəsinin qarşısında durar. Əgər namaz qılan üzünü çevirib yayınsa Allah da onu tərk edər”* (Əbu Davud, İbn Xuzeymə və i.a. Səhih hədisdir).

O, üç şeyi qadağan etmişdir: “*(Namazda) xoruz kimi dənləməyi, it kimi çömbəlməyi və tülkü kimi ətrafa boylanmağı”* (Əhməd və Əbu Yəla. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Namaz qılanda sanki son namazı qılır kimi namaz qıl, elə bil ki, sən Onu görürsən, ya da O səni görür”* (ət-Təbərani, ər-Ruyani, əz-Ziya, İbn Macə, Əhməd, İbn Asəakir və əl-Heytəmi. Səhih hədisdir).

O, həmçinin demişdir: "*Hər kəs vacib namaza hazırlaşır. Onun dəstəmaz alması, müti olması, rükusu ehsan sayılır, böyük günahlarından başqa kəffarəsidir (bağışlanmasıdır). Bu cür bütün ömrü boyu davam edər (günahları yuyular)"* (Müslim).

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- əynində naxışlı yun paltar namaz qıldı. Namazı bitirdikdə paltarın naxışlarına baxdı və gedəndə dedi: "Bu naxışlı paltarı aparıb Əbu Cəhmə verin. Ondan üzərində heç bir naxışı olmayan cod Kisa (paltar) alıb gətirin. Bu paltar məni namazdan yayındırdı. (*Başqa bir rəvayətdə deyilir: *"onun naxışları mənə namazda mane olurdu")"* (əl-Buxari, Müslim və Malik).

"*Aişənin otağında üstündə şəkillər olan pərdələr asılmışdı. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- namaza başlamamışdan əvvəl demişdi: "Bu pərdələri çıxarın. Onların şəkilləri mənim namazıma mane ola bilər"*[26] (əl-Buxari və Müslim).

---

[26] Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* gülləri pozmağı, silməyi əmr etməmişdi, yalnız onları pisləmiş və pərdəni kənara qoydurmaqla kifayətlənmişdir. Çünki bunlar canlı olmamışlar, yalnız şəkil olmuşlar. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* ümumiyyətlə şəkilləri pisləmişdir.

O, həmçinin deyərdi: “*Ortada yemək olanda namaz qılmaq olmaz. Ayaq yoluna getmək istəyərək (ehtiyacını ödəməyərək) də naaz qılmaq da olmaz”* (əl-Buxari, Müslim, İbn Əbi Şeybə).

## NAMAZIN AÇILIŞ DUALARI

**P**eyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazda qiraəti çoxsaylı və müxtəlif dualar oxumaqla başlayardı. Bu dualarda o, Allaha şükür və tərif deyərdi, həmd edərdi. Buna görə də “namazını düzgün qılmayana əmr edərək demişdir: “*Hər hansı bir şəxsin namazı yalnız təkbir, Böyük və Qadir Allaha həmd (əl-Fatihə) və bacardığı Quran ayəsini oxumaqla bitir”* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Müxtəlif dualar oxuyardı. Deyərdi:

1 - (( اللَّهُمَّ بَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ ، اللَّهُمَّ نَقِّنِي مِنْ خَطَايَايَ كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ ، اللَّهُمَّ اغْسِلْنِي مِنْ خَطَايَايَ بِالثَّلْجِ وَالْمَاءِ وَالْبَرَدِ )) -

**«Allahuммə bə‘id beyni va beynə хатауəуə кəмə bə‘адтə beynə-l-мəşriqi va-l-мəğribi, Allahuммə nəqqini мin хатауəуə кəмə yunəqqa-s-saubu-l-abyədu мinə-d-dənəsi, Allahuммə-ğsilni мin хатауəуə bi-s-səlci va-l-мə‘i va-l-bəradi»** [*Allahım! Gündoğanla günbatanı uzaqlaşdırdığın kimi məni də günahlarımdan (xətalarımdan) uzaqlaşdır. Allahım! Məni günahlarımdan təmizlə, necə ki, ağ paltar kirdən təmizlənir. Allahım! Məni qarla, su ilə, dolu ilə günahlarımdan yu*] (əl-Buxari, Müslim və İbn Əbi Şeybə). Bunu fərzdə deyərdi.

- 2 - (( وَجَّهْتُ وَجْهِيَ لِلَّذِي فَطَرَ السَّمَوَاتِ وَٱلأَرْضَ حَنِيفًا وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ، إِنَّ صَلاَتِي، وَنُسُكِي، وَمَحْيَايَ، وَمَمَاتِي للهِ رَبِّ الْعَالَمِينَ، لاَ شَرِيكَ لَهُ وَبِذَلِكَ أُمِرْتُ وَأَنَا مِنَ الْمُسْلِمِينَ. اللَّهُمَّ أَنْتَ الْمَلِكُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ، أَنْتَ رَبِّي وَأَنَا عَبْدُكَ، ظَلَمْتُ نَفْسِي وَاعْتَرَفْتُ بِذَنْبِي، فَاغْفِرْ لِي ذُنُوبِي جَمِيعًا، إِنَّهُ لاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ، وَاهْدِنِي لأَحْسَنِ ٱلأَخْلاَقِ، لاَ يَهْدِي لأَحْسَنِهَا إِلاَّ أَنْتَ، وَاصْرِفْ عَنِّي سَيِّئَهَا، لاَ يَصْرِفُ عَنِّي سَيِّئَهَا إِلاَّ أَنْتَ. لَبَّيْكَ وَسَعْدَيْكَ، وَالْخَيْرُ كُلُّهُ بِيَدَيْكَ، وَالشَّرُّ لَيْسَ إِلَيْكَ، أَنَا بِكَ وَإِلَيْكَ، تَبَارَكْتَ وَتَعَالَيْتَ، أَسْتَغْفِرُكَ وَأَتُوبُ إِلَيْكَ ))

**«Vaccəhтu vachiyə lilləzi fəтara-s-səмəvaтi va-l-ardı hənifən va мə ənə мinə-l-мuşriкin, innə saləтi, va**

**nusuкi, va мəhyəyə, va мəмəтi lilləhi rabbi-l-aləмin, lə şərікə ləhu va bizəlікə uмirтu va ənə мінə-l-мuslіміn. Allahuммə əнтə-l-мəlікu lə iləhə illə əнт, əнтə rabbi va ənə abduкə, zaləмтu nəfsi va'тaraftu bizənbi, fəğfir li zunubi cəмian, innəhu lə yağfiru-z-zunubə illə əнт, vahdini li əhsəni-l-əxləqi, lə yəhdi liəhsənihə illə əнт, vasrıf anni seyyiəhə, lə yasrıfu anni seyyiəhə illə əнт. Ləbbeyкə va sə'deyк, va-l-xeyru кulluhu biyədeyкə, va-ş-şərru leysə ileyк, ənə biкə va ileyкə, тəbəraктə va тealeyт, asтağfiruкə va əтubu ileyк»** [*Üzümü səmaların və yerin Yaradanına çevirdim. Hənifəm və Ona şərik qoşanlardan deyiləm. Namazım, ibadətim, həyatım, ölümüm aləmlərin Rəbbi olan Allah üçündür. Onun şəriki yoxdur. Bunlar mənə əmr olundu və mən müsəlmanlardanam. Allahım! Malik, Yökmdar Sənsən, Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Sən Rəbbimsən, mən Sənin qulunam.*[27]*Nəfsimə zülm etdim. Günahımı e'tiraf edirəm. Bütün günahlarımı bağışla. Şübhəsiz ki, günahları bağışlayan ancaq Sənsən. Məni əxlaqın ən gözəli ilə hidayətləndir,*

[27] əl-Əzhəri yazır ki, bu "Səndən qeyrisinə ibadət etmirəm" mənasını verir.

*ondan yaxşısıyla Səndən başqa heç kəs hidayətləndirməz. Pis əxlaqdan məni uzaqlaşdır, çünki yalnız Sən uzaqlaşdıransan. Budur, Sənin qarşındayam. Xeyir yalnız Sənin əlindədir və şər Səndən deyil.*[28] *Məni Sən yaratdın və Sənin hüzuruna qayıdacağam. Mübarək və Ucasan. Səndən günahlarımın bağışlanmasını diləyir və Sənə tövbə edirəm*] (Müslim, Əbu Uvanə, Əbu Davud, ən-Nəsai, İbn Hibban, Əhməd, əş-Şafii və ət-Təbərani). Bunu fərz və nafilədə deyərdi.

[28] Şər Allah təalaya mənsub edilmir. Çünki Allah təalanın əməlində şər ola bilməz. Qüdrət və Cəlal sahibinin əməlləri tamamilə xeyirlidir. Onun əməlləri ədalət, fəzilət və hikmət dairəsindədir, bütünlüklə xeyirdir, onda şər olmaz. Şər ona görə şər olmuşdur ki, onun Təala ilə əlaqəsi kəsilmişdir? Ona aid edilə bilməz. Mərhum İbn Qayyim demişdir: "Subhanəhu xeyrin də, şərin də xaliqidir. Onun bəzi məxluqlarında olan şər Onun xilqətindən, əməlindən ola bilməz. Zülm hər hansı şeyin yerində olmamasıdır (yəni hər hansı bir əməlin, işin yerinə düşməməsidir - Z.Q.). Subhanəhu təala zülmdən uzaqdır. Çünki, O hər bir şeyi ona layiq yerində qoyur (Onun hər bir əməli yerinə düşür - Z.Q.). Bu isə bütünlüklə xeyirdir. Şər isə bir şeyin ona aid olmayan yerdə qoyulmasıdır. Əgər şey layiq olduğu yerdədirsə bu şər ola bilməz. Şər Ona aid deyildir. Sən soruşa bilərsən: Bəs onda O şəri nə üçün yaratdı? Cavabını belə verirəm: Onu da Allah yaratmışdır. Lakin məqsəd xeyirdir, şər deyildir. Yaratmaq və onu həyata keçirmək Allaha aiddir. Şərin ona aidliyi və Onun şərlə vəsfi mümkün deyildir. Məxluqda olan şər Xaliqə aid edilə bilməz. Ona yalnız xeyir olan xilqət və əməl aid edilə bilər".

3 – Aşağıdakı ifadələr istisna olunmaqla eyni duanı oxuyardı: ((أَنْتَ رَبِّي وَأَنَا عَبْدُكَ)) **«Əntə Rabbi va ənə abdukə»** [*Sən mənim Rəbbimsən, mən Sənin qulunam*.

Bu zaman (( اللَّهُمَّ أَنْتَ الْمَلِكُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ، سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ )) **«Allahummə əntə əl-Məliku, lə iləhə illə əntə, subhanəkə və bihəmdik»** [*Allahım! Sən Hökmdarsan (Məlik). Səndən başqa ilah (tanrı) yoxdur. Sən pak və nöqsansızsan, həmd Sənədir*] ifadəsini əlavə edərdi (ən-Nəsai. Səhih hədisdir).

4 – ((وانا اول المسلمين)) **«va ənə əvvəlul-muslimin»** [*Mən ilk müsəlman kimi*] ifadəsinə qədər eyni duanı oxuyardı və bunları əlavə edərdi:

(( اللهم اهدني لاحسن الاخلاق ، و ا حسن الاعمال لا يهدي لا حسنها الا انت ، و قني سيء الاخلاق و الاعمال لا يقي سيها الا انت ))

**«Allahummə ihdini li əhsənil əxlaqi va əhsənil-ə'aməli, lə yəhdi li əhsənihə illə əntə, va qini seyyiəl-əxlaqi val-ə'aməli, lə yiqa seyyiəhə illə əntə»** [*Ey Allahım! Məni ən yaxşı əxlaq və ən yaxşı əməllə*

*hidayətləndir. Onun ən yaxşısı ilə Səndən başqa heç kəs hidayətləndirməz. Məni pis əxlaq və əməldən qoru. Pisliklərdən qoruyan yalnız Sənsən*] (ən-Nəsai və əd-Dəraqutni. Səhih hədisdir).

5 - (( سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ ، وَتَبَارَكَ اسْمُكَ ، وَتَعَالَى جَدُّكَ ، وَلاَ إِلَهَ غَيْرُكَ )) -

**«Subhanəкə-l-lahuммə va bihəмdiк, va тəbərакə isмuк, va тəalə cədduк,**[29] **va lə iləhə ğeyruк»** [*Nöqsansız və Həmd sahibi olan Allahım! Adın mübarək, və əzəmətin ucadır, Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur*] (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Bəndənin Allaha ən çox xoş gələn sözləri bunlardır:*

---

[29] *Subhanəkə* - Yəni Səni daim zikr edirəm, Səni bütün nöqsanlardan uzaq bilirəm. *Bihəmdikə* - Biz Sənin həmdü sənana bürünmüşük. *Təbarəkə* - Sənin adın zikr olunduqca Sənin bərəkətin və xeyrin də artır. *Təalə cəddukə* - Cəlalət və Əzəmətin ən ali dərəcəsidir.

سُبْحَانَكَ اللَّهُمَّ ... **«Subhanəкə-l-lahuммə …»** (İbn Məndə, ən-Nəsai və İbn Kəsir. Səhih hədisdir).

6 – Eyni duanı gecə namazında da oxuyardı. Əlavə olaraq bunları deyərdi: لاَ إِلَهَ إلاَّ اللهُ **«Lə iləhə illəllah»** (üç dəfə), اللهُ أَكْبَرُ كَبِيرًا **«Allahu əкbər кəbiran»** (üç dəfə) (Əbu Davud və ət-Təhavi. Etibarlı hədisdir).

7 – (( اللهُ أَكْبَرُ كَبِيرًا، وَالْحَمْدُ للهِ كَثِيرًا، وَسُبْحَانَ اللهِ بُكْرَةً وَأَصِيلاً )) -

**«Allahu əкbəru кəbiran, va-l-həмdu lilləhi кəsiran, va subhanə-l-lahi buкratən və asılən»** [*Allah hər şeydən üstündür, böyükdür; Allahın həmdi hədsizdir, çoxdur; səhərlər və axşamlar Allahı təsbih edirik*].

Əshabələrdən biri bu sözləri deyərkən bunu eşidən Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təəccüblə demişdir: "*Nə gözəl dedin. Bununla səma qapıları açılır"* (Müslim, Əbu Uvanə, ət-Tirmizi və Əbu Nəim. Səhih hədisdir).

8 – Başqa birisinin namazda: (( الْحَمْدُ للهِ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ )) -

**«Əlhəмdu lilləhi həмdən кəsiran, тayyibən, мübarəкən fihi»** [*Allaha həmd hədsiz çoxdur, onda yaxşılıq və xeyir-dua vardır*] - dediyini eşitdikdə deyir: *"Mən on iki mələk gördüm. Bu sözləri səmaya qaldırmaq üçün onlar yarışa girmişdilər"* (Müslim və Əbu Uvanə).

9 - (( اللَّهُمَّ لَكَ الْحَمْدُ أَنْتَ نُورُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ، وَلَكَ الْحَمْدُ أَنْتَ قَيِّمُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ، [وَلَكَ الْحَمْدُ أَنْتَ رَبُّ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ] [ وَلَكَ الْحَمْدُ لَكَ مُلْكُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ] [ وَلَكَ الْحَمْدُ أَنْتَ مَلِكُ السَّمَوَاتِ وَالأَرْضِ ] [وَلَكَ الْحَمْدُ] [ أَنْتَ الْحَقُّ ، وَوَعْدُكَ الْحَقُّ ، وَقَوْلُكَ الْحَقُّ ، وَلِقَاؤُكَ حَقٌّ ، وَالسَّاعَةُ حَقٌّ ] [ ρالْحَقُّ ، وَالْجَنَّةُ حَقٌّ ، وَالنَّارُ حَقٌّ ، وَالنَّبِيُّونَ حَقٌّ ، وَمُحَمَّدٌ اللَّهُمَّ لَكَ أَسْلَمْتُ، وَعَلَيْكَ تَوَكَّلْتُ، وَبِكَ آمَنْتُ، وَإِلَيْكَ أَنَبْتُ، وَبِكَ خَاصَمْتُ، وَإِلَيْكَ حَاكَمْتُ، فَاغْفِرْ لِي مَا قَدَّمْتُ، وَمَا أَخَّرْتُ، وَمَا أَسْرَرْتُ، وَمَا أَعْلَنْتُ] [ أَنْتَ الْمُقَدِّمُ، وَأَنْتَ الْمُؤَخِّرُ ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ ] [ أَنْتَ إِلَهِي لاَ إِلَهَ إِلاَّ أَنْتَ ] ))

**«Allahuммə ləкə-l-həмdu əнтə nuru-s-səмəvaтi va-l-ard va мən fihinnə, va ləкə-l-həмdu əнтə qayyiмu-s-səмəvaтi va-l-ard va мə fihinnə, [va ləкə-l-həмdu əнтə rabbu-s-səмəvaтi va-l-ardı va мən**

**fihinnə] [va ləкə-l-həмdu ləкə мulкu-s-səмəvaтi va-l-ard va мən fihinnə] [va ləкə-l-həмdu ənтə мəliкu-s-səмəvaтi va-l-ardı] [va ləкə-l-həмdu] [ənтə-l-haqq, va va‘duкə-l-haqq, va qauluкə-l-haqq, liqauкə-l-haqq, va-l-cənnəтu haqq, va-n-nəru haqq, va-n-nəbiyyunə haqq, va Muhaммəd (s.a.v.) haqq, va-s-sə‘aтu haqq] [Allahuммə ləкə əsləмтu, va aleyкə тəvaккəlтu, va biкə-əмənтu, va ileyкə ənəbтu, va biкə xasaмтu, va ileyкə haкəмтu, fəğfir li мə qaddəмтu, va мə əxxərтu, va мə əsarтu, va мə ə‘lənтu] [ənтə-l-мuqaddiмu, va ənтə-l-мuəxxiru lə iləhə illə ənт] [ənтə iləhi lə iləhə illə ənт]»** [*Allahım! Həmd Sənə məxsusdur. Sən səmaların, yerin və onların arasında olanların Nurusan.*[30] *Həmd Sənə məxsusdur. Sən səmaların, yerin və onların arasında olanların Nəzarətçisisən.*[31] [*Həmd Sənə məxsusdur. Sən səmaların, yerin və onların arasında olan hər şeyin Rəbbisən*][*Həmd Sənə məxsusdur. Sən səmaların, yerin və onların arasında olan hər şeyin ixtiyar Sahibisən*][*Həmd Sənə*

---

[30] Yəni Sən səmalara, Yerə və onlarda olanlara nur saçırsan.
[31] Yəni Sən səmaların və Yerin hamisi və qəyyumusan.

*məxsusdur. Sən səmaların, yerin və onların arasında olan hər şeyin Hökmdarısan*][*Həmd Sənə məxsusdur*][*Sən haqsan, və'din də haqdır. Bütün dediklərin haqdır, və Sənə dönüş haqdır, Cənnət də, Cəhənnəm də haqdır, peyğəmbərlərin də haqdır, Məhəmməd (s.a.v.) haqdır və Qiyamət də haqdır*][*Allahım! Sənə özümü təslim etdim, Sənə arxalandım, Sənə iman gətirdim, günah işlətdiyim üçün Sənin qarşında peşimanam, insanlarla Sənin adını tutub mübahisə edirəm, Sənin hökmünə güvənirəm. Əvvəlki və sonrakı, gizli və aşkar günahlarımı bağışla*][*Hadisələri əvvələ və axıra çəkmək haqqı Sənindir, Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur*][*Sən mənim haqq Məbudumsan. Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur*] (əl-Buxari, Əbu Uvanə, Əbu Davud, İbn Nəsr və əd-Darimi).

10 - Gecə namazında Peyğəmbər *-sələllahu aleyhi və alihi və səlləm-* aşağıdakı duaları oxuyardı:

- (( اللَّهُمَّ رَبَّ جِبْرَائِيلَ ، وَمِيكَائِيلَ ، وَإِسْرَافِيلَ ، فَاطِرَ السَّمَوَاتِ وَالْأَرْضِ ، عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ ، أَنْتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ ، اهْدِنِي لِمَا اخْتُلِفَ فِيهِ مِنَ الْحَقِّ بِإِذْنِكَ ، إِنَّكَ تَهْدِي مَنْ تَشَاءُ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ ))

**«Allahuммə rabbə cibrailə, va мiкəilə, va israfilə faтıra-s-səмəvaтi va-l-ardı aliмə-l-ğeybi va-ş-şəhadəтi, əнтə тəhкuмu beynə ibədiкə fiмə кənu fihi yəxтəlifun. İhdini liмə-xтulifə fihi мinə-l-haqqi bi izniкə innəкə тəhdi мən тəşə'u ilə sıraтın мusтəqiм»** [*Cəbrayılın, Mikayılın, İsrafilin Rəbbi! Səmaların və Yerin yaradanı, qeybi və aşkarı bilən Allahım! Qullarının arasındakı ixtilafda ədalətli hökm verən Sənsən. İxtilafa düşsəm, məni haqqa yönəlt. Həqiqətən Sən istədiyini doğru hola yönəldirsən*]. (Müslim və Əbu Uvanə).

11 – On dəfə اللهُ أَكْبَرُ **«Allahu əкbər»**, on dəfə اَلْحَمْدُ للهِ **«Əlhəмdulilləh»**, on dəfə سُبْحَانَ اللهِ **«Subhanəllah»**, on dəfə لاَ إِلَهَ إِلاَّ اللهُ **«Lə iləhə illəllah»** deyərdi, on dəfə istiğfar (bağışlanmağını) diləyərdi (( اللَّهُمَّ اغْفِرْ لِي)) **«Allahuммə-ğfirli»** və deyərdi:

(( اللَّهُمَّ اغْفِرْ لِي، وَاهْدِنِي، وَارْزُقْنِي، وَعَافِنِي)) **«Allahuммə-ğfirli, vahdini, varzuqni, vaafini»** [*Allahım! Məni bağışla, məni doğru yola yönəlt, mənə ruzi ver, mənə afiyət (sağlamlıq) bəxş et*].

Həmçinin on dəfə deyərdi:

((اللهم اني اعوذ بك من الضيق يوم الحساب)) **«Allahuммə-ğfirli, vahdini, varzuqni, vaafini»** [*Allahım! Hesab gününün çətinliyindən Sənə sığınıram!*] (Əhməd, İbn Əbi Şeybə, Əbu Davud və ət-Təbərani. Səhih və ya yaxşı hədisdir).

12 – O deyərdi: اللهُ أَكْبَرُ (3 dəfə) **«Allahu əкbər»** sonra:

((ذِي ٱلْمَلَكُوتِ، والْجَبَرُوتِ وَٱلْكِبْرِيَاءِ، وَٱلْعَظَمَةِ ))

**«Zil-мələкuтi, val-cəbəruтi, val-кibriyəi, val-azaмəтi»** [*Səltənət, qüdrət, ülviyyət və əzəmət sahibi Allah böyükdür*] (ət-Təyaləsi və Əbu Davud. Səhih hədisdir).

QİRAƏT

B undan sonra Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Allah təaladan kömək diləyib deyirdi:

(( أَعُوذُ بِاللهِ مِنَ الشَّيْطَانِ الرَّجِيمِ مِنْ نَفْخِهِ وَنَفْثِهِ وَهَمْزِه))

**«Əuzu billəhi мinəş-şeyтani-r-racім, мin nəfxihi, va nəfsihi va həмzihi»** [*Mən məlun şeytanın həmzindən, nəfxindən və nəfsindən*[32] *qorunmaq üçün Allahdan kömək diləyirəm*] (Əbu Davud, İbn Macə, əd-Dəraqutni, əl-Hakim, İbn Hibban və əz-Zəhəbi. Səhih hədisdir).

Bəzən də deyilənlərə (( أَعُوذُ بِاللهِ السميع العليم من الشيطان ...)) **«Əuzu billəhi səмiil aliмi мinəş-şeyтani…»** [*Eşidən və Bilən Allaha sığınıram şeytanın...*] əlavəsini edərdi (Əbu Davud, ət-Tirmizi və Əhməd. Yaxşı hədisdir).

Daha sonra astadan deyərdi: “*Bismilləhir-rahmənir-rahim”* (əl-Buxari, Müslim, Əbu Uvanə, ət-Təhavi və Əhməd).

HƏR AYƏNİN AYRICA QİRAƏTİ

---

[32] *Həmz* bir növ dəlilik, *nəfx* - təkəbbür, *nəfs* isə günah şer deməkdir.

"*Bütün bunlardan sonra Peyğəmbər -səlləllahu aleyhi və alihi və salləm- "əl-Fatihə"ni aramla oxuyardı: "***Bismilləhir-rahmənir-rahim***" – dayanardı və sonra deyərdi: "***Əl-həmdu lilləhi rabbil aləmin***" – yenə dayanar və deyərdi: "***Ər-rahmənir-rahim***" – dayanar və deyərdi: "***Maliki yaumid-din...***" –* **[Mərhəmətli, rəhmli Allahın adı ilə! Həmd olsun Allaha aləmlərin Rəbbinə, (*bu dünyada hamıya*) mərhəmətli, (*axirətdə isə ancaq möminlərə*) rəhmli olana, haqq-hesab (*qiyamət*) gününün sahibinə!...].** *Bu cür surəni axıra qədər oxuyardı. Hər bir ayənin başında fasilə verərdi, bir ayəni o biri ilə birləşdirməzdi*[33] (Əbu Davud, əs-Səhmi və əl-Hakim. Səhih hədisdir). Bəzən "**Maliki yaumid-din"** *əvəzinə "***Məliki yaumid-dini** *oxuyardı* (ər-Razi, İbn Əbi Davud, Əbu Nəim, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

## FATİHƏNİN RÜKN OLMASI VƏ FƏZİLƏTLƏRİ

[33] Mən deyirəm: "Bu Sünnə (qanun) olsa da hazırkı dövrün qarilərindən (Quran oxucularından - Z.Q.) çoxu ona mültəzim olmuşlar.

P eyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bu surənin əzəmətini həmişə yüksək tutardı və deyərdi: "*Kitabın "əl-Fatihə"sini oxumayan şəxsin namazı qəbul olunmaz"* (əl-Buxari, Müslim, Əbu Uvanə və əl-Beyhəqi), və ya "*Kitabın "əl-Fatihə"sini oxumayan şəxsin namazı düzgün olmaz"* (əd-Dəraqutni və İbn Hibban. Səhih hədisdir). Bəzən deyərdi: "*Namaz qılan adam Kitabın "əl-Fatihə"sini oxumazsa, bu namaz naqis (natamam) olar"*.[34]

O, bu surə barədə demişdir: "*Allah təbarəkə təala buyurur: Mən namazı Özümlə bəndəm arasında yarı bölmüşəm. Yarısı mənimdir, yarısı da bəndəmin. Bəndəm istəyinə çatar"*. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Oxuyun: Bəndə deyər:* **"*Əl-həmdu lilləhi rabbil aləmin*"** [**Həmd olsun Allaha aləmlərin Rəbbinə**]. *Allah təala buyurur:* "*Bəndəm Mənə həmd etdi, şükür və tərif dedi. Bəndə deyər:* **"*Ər-rahmənir-rahim*"** [**Mərhəmətli və rəhmli olana**]. A*llah təala buyurur:* "*Bəndəm Mənə səna etdi, tərif söylədi*. *Bəndə deyər:* **"*Maliki yaumid-din*"** [**Haqq-hesab (*qiyamət*) gününün sahibinə!**] *Allah təala buyurar:* "*Bəndəm Məni mədh, tərif etdi. Bəndə deyər:* **"*İyyəkə***

---

[34] Peyğəmbər (s.a.v.) bunu həm də "Tamam olmayan" adlandırmışdır.

***nəbudu və iyyəkə nəstəin*”** [**Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!**]. *Allah təala buyurar:* “*Bu Mənimlə bəndəm arasındadır. Bəndəm istədiyinə çatar. Bəndə deyər:* ***“İhdinəs-sıratəl-mustəqim. Sıratəl-ləzinə ənamtə aleyhim ğeyril-məğdubi aleyhim vəlad-dallin*”** [**Bizi doğru yola yönəlt! Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olmuşların və (*haqdan*) azmışların (*yoluna*) yox!**] *Allah təala buyurar: “Ona istədiklərini verəcəyəm”* (Müslim, Əbu Davud, Əbu Uvanə və Malik).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* həmçinin demişdir: “*Qüdrət və Cəlal sahibi Allah nə Tövratda, nə də İncildə Quranın* (hərfən anası) *olan yeddi Məsanini (və Sizə çatdırdığım) əzəmətli Quranı vermişdir”.*[35]

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “namazını düzgün qılmayana “əl-Fatihəni oxumağı əmr etmişdir. Onu əzbər öyrənə bilməyən isə deməlidir:

---

[35] əl-Baci demişdir: "Təalanın bu sözləri nəzərdə tutulur: "Sənə yeddi məsani və əzəmətli Quranı verdik". Yeddi ona görə deyilir ki, o (əl-Fatihə) yeddi ayədən ibarətdir. Məsani ona görə deyilir ki, hər bir rükətdə təkrarlanır.

-(( سُبحَانَ اللهِ، والَحمْدُ للهِ، ولاَ إلَهَ إلاّ اللهُ، واللهُ أكبَرُ، ولاَ حَولَ وَلاَ قُوّةَ إلاّ باللهِ ))

**«Subhanəllahi, vəl həмdulilləhi və lə iləhə illəlah. Allahu əкbəru və lə haulə quvvaтə illə billəh»** [*Allah pak və nöqsansızdır, həmd Allaha məxsusdur, Allah hər şeydən üstündür, böyükdür, Güc və Qüdrət Allaha məxsusdur*] (Əbu Davud, İbn Xuzeymə, əl-Hakim, ət-Təbərani və İbn Hibban. Səhih hədisdir).

O, "namazını düzgün qılmayana demişdir: "*Yanınızda Quran olsa, onu oxuyun. Olmasa, Allaha həmd edin, "Allahu əkbər" və Allahın təkliyinə şəhadət deyin"* (Əbu Davud və ət-Tirmizi. Etibarlı hədisdir).

## İMAMIN ARDINCA UCA SƏSLƏ QİRAƏTİN QADAĞAN EDİLMƏSİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* əvvəllər imamın arxasında namaza duranlara "əl-Fatihəni uca səslə qılınan namazda oxumağa icazə vermişdi. Bir dəfə "*sübh namazı vaxtı qiraət onu yordu. Namazı bitirdikdən*

*sonra dedi: "Siz də, yəqin ki, imamınızın ardınca oxuyursunuz? Biz dedik: "Bəli, ya Rəsulullah, bir sürətlə, tələsə-tələsə oxuyurduq. Dedi: "Belə etməyin. Biriniz yalnız "əl-Fatihə"ni oxusa bəsdir. Çünki "əl-Fatihə"ni oxumayanın namazı qəbul olmaz* (əl-Buxari, Əbu Davud, Əhməd, ət-Tirmizi və əd-Dəraqutni. Etibarlı hədisdir).

Sonralar surənin bütünlüklə uca səslə oxumağı qadağan etdi. Bu, "sübh namazı vaxtı uca səslə qiraəti bitirdikdən sonra baş vermişdi və demişdi: "*Sizdən kimsə mənimlə birgə qiraət etdi? Bir şəxs dedi: "Mən, ya Rəsulullah! O dedi: "Qiraətə müdaxilə etməyin.*[36] Əbu Hureyrə deyir: "*Camaat Rəsulullahla -səlləllahu aleyhi və alihi və səlləm- birlikdə uca səslə qiraətdən əl çəkdi. Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- qiraəti uca səslə bitirdi. Onlar Rəsulullahdan -səlləllahu aleyhi və alihi və səlləm- bu sözləri eşidəndə imamın uca səslə oxumadıqları vaxt özləri sakit səslə qiraət etdilər* (Malik, əl-Humeydi, əl-Buxari, Əbu Davud, Əhməd, əl-Məhali, ət-Tirmizi, ər-Razi, İbn Hibban və İbn əl-Qayyim. Etibarlı və səhih hədisdir).

---

[36] Bu sürətlə qiraət deməkdir.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* imamın qiraətinə qulaq asmağı və onu tamamilə təqlid etməyi əmr edərək demişdir: "*İmam tamamilə təqlid edilməlidir. Əgər təkbir eləsə, siz də təkbir edin. Əgər qiraət etsə, siz onu dinləyin* (İbn Şeybə, ƏbuDavud, Müslim, Əbu Uvanə və ər-Ruyani).

O həmçinin imama qulaq asmağı vacib bilib qiraət etməməyə icazə verərək demişdir: "*İmam arxasında qiraət edən üçün imamın qiraəti elə onun qiraətidir* (İbn Əbi Şeybə, əd-Dəraqutni, İbn Macə, ət-Təhavi və Əhməd).

## SAKİT SƏSLƏ QİRAƏTİN VACİBLİYİ

Sakit səslə qiraəti Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* vacib saymışdır.

Cabir demişdir: "*Zöhr və əsr namazları vaxtı imamın ardınca birinci iki rükətdə "əl-Fatihə"ni və başqa bir surəni oxuyardıq. Sonuncu iki rükətdə də "əl-Fatihə"ni oxuyardıq* (İbn Macə. Səhih hədisdir).

Bununla belə qiraətdə imama mane olmaq, onu çaşdırmaq da yasaq edilmişdir. Zöhr namazını öz əshabələri

ilə qılırmış. Namazdan sonra dedi: "*Sizdən kim "Ən Uca Rəbbin adını zikr et" (əl-Əla, 1) surəsini oxuyurdu? Bir nəfər dedi:* "*Mən. Bununla mən xeyirxahlıq istəmişəm*. *Rəsulullah dedi:* "*Mən hiss edirdim ki, kimsə fikrimi yayındırdı* (Müslim, Əbu Uvanə və əs-Sərrac).

Başqa bir hədisdə deyilir: "*Namaz qılan öz Rəbbi ilə gizli söhbət edir ki, Allah onun diləyini bilsin. Siz Quranı oxumaqla bir-birinizə mane olmayın* (Malik və əl-Buxari. Səhih hədisdir).

## AMİN VƏ İMAMIN ONU UCA SƏSLƏ DEMƏSİ

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- "əl-Fatihə"ni oxuyub qurtarandan sonra uca səslə və səsini uzadaraq "amin" deyərdi* (əl-Buxari və Əbu Davud. Səhih hədisdir).

O, həmçinin imamın arxasında namaz qılanlara imamla "amin deməyi əmr edərək demişdir: "*Əgər imam* "**ğeyril məğdubi və aleyhim vəlad-dallin** *desə, siz də "amin" deyin. Bu zaman mələklər də "amin" deyirlər. İmam da "amin" deyir"*.

Başqa variantda deyilir: “*Əgər imam “amin” deyirsə, siz də deyin. İmamla birgə “amin” deyən bu sözü mələklərlə birgə demiş olur”*.

Başqa variantda deyilir: “*Biriniz namazda “amin” deyərsə, deməli, bir-birinizlə ittifaqda olursunuz. Bununla da bütün əvvəlki günahlar bağışlanır* (əl-Buxari, Müslim, ən-Nəsai və əd-Darimi).

Başqa bir hədisdə deyilir: “*Amin deyin ki, Allah sizin duanıza cavab versin (qəbul etsin)* (Müslim və Əbu Uvanə).

O həmçinin demişdir: “*Yəhudilər sizə bir şeydə həsəd aparırlar: imamın ardınca salam verməyə və “amin” deyilməsinə*[37] (əl-Buxari, İbn Macə, İbn Xuzeymə, Əhməd və əs-Sərrac. Səhih hədisdir).

## PEYĞƏMBƏRİN (s.a.v.) FATİHƏDƏN SONRA QİRAƏTİ

P eyğəmbər *-səlləllahu aleyhi və alihi və*

[37] İmamın arxasında namaz qılanlar "Amin" sözünü uca səslə eyni vaxtda deyərdilər. Onlar indi bəzilərinin etdiyi kimi imamı qabaqlamazdılar və çox da gecikməzdilər.

*səlləm-* “əl-Fatihədən sonra başqa bir surə oxuyardı. Bəzən bu qiraəti uzadardı, bəzən isə səfər ərəfəsində olanda, öskürmək istəyəndə, xəstələndikdə və ya uşaq ağlayanda qısaldardı. Ənəs bin Malik *–radıyallahu anhu-* demişdir: “*Bir dəfə sübh namazında Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- qiraəti qısaltdı*.

Başqa bir hədisdə deyilir: “*Sübh namazında Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- Quranın ən qısa iki surəsini oxudu. Ona dedilər: “Ya Rəsulullah! Nə üçün belə qısaltdın?” O buyurdu: “Uşağın ağlamaq səsini eşitdim. Zənn etdim ki, anası bizimlədir, namaz qılır. Buna görə də ananı tez uşağın harayına göndərmək istədim”*.

O deyərdi: “*Mən namaza başlayanda onu uzatmaq istəyirəm. Amma uşağın ağladığını eşidəndə onu qısaltmalı oluram. Mən öz uşağının ağladığını eşidən ananın necə narahat olduğunu bilirəm* (əl-Buxari və Müslim).

Həmişə namazı surənin birinci ayəsi ilə başlayar və çox zaman onu axıra qədər oxuyardı. O deyərdi: “*Hər bir*

*surəyə onun rüku və səcdə payını verin* və ya "*hər bir surənin rükəti vardır*[38] (İbn Nasr və ət-Təhavi. Səhih hədisdir).

"*Bəzən surəni iki rükət arasında bölərdi* (Əhməd və Əbu Yəla). Bəzən də surəni bütövlükdə ikinci rükətdə təkrar oxuyardı. Bəzən isə bir rükətdə iki və daha artıq surəni birləşdirərdi: "*Ənsarlardan bir nəfər Quba məscidində imamlıq edirdi. Hər dəfə "əl-Fatihə"dən sonra başqa surəni oxumazdan əvvəl "Qul huva Allahu əhəd" ("əl-İxlas") surəsini oxuyur, tamamlayır, sonra başqa bir surəni oxuyurdu. O, hər rükətdə təkrar edərdi. Dostları ona (irad tutaraq) deyirlər: "Sən hər dəfə bu surə ("əl-İxlas") ilə başlayırsan. Görürsən ki, tək bunu oxumaq bəs deyil mütləq əlavə başqa surəni də oxuyursan". O (cavabında) deyir: "Mən bu surəni tərk edən deyiləm. Əgər istəyirsiniz mən sizə imam olum, onda mən belə qılacağam. Yox, istəməsəniz qoy başqası imam olsun.*

*Onu öz aralarında ən yaxşısı hesab etdiklərinə görə başqası ilə əvəz etmədilər. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- onların yanına gəldikdə əhvalatı ona*

---

[38] Burada namazın qısaldılması nəzərdə tutulur. Bu hədisdən göründüyü kimi, kiçik yaşlı uşaqların məscidə gətirilməsinə icazə verilmişdir. Bunun əksini, yəni uşaqların məscidə girməsini qadağan edən hədislər isə düzəltmədir, zəifdirlər.

*danışdılar. O dedi: "Ey, filankəs! Dostlarının istəyini yerinə yetirməyə sənə nə mane olur? Hər rükətdə bu surəni mütləq oxumağa səni nə vadar edir?" Həmin kişi deyir: "Mən bu surəni çox sevirəm". Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- deyir: "Sənin ona məhəbbətin səni cənnətə daxil etdi"* (əl-Buxari və ət-Tirmizi. Səhih hədisdir).

## PEYĞƏMBƏRİN (s.a.v.) EYNİ MƏNALI SURƏLƏRİ VƏ BAŞQALARINI BİR RÜKƏTDƏ TOPLAMASI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bir rükətdə yaxın mənalı iki surəni oxuyardı. Belə ki, "ər-Rəhman (55:78) və "ən-Nəcm (53:62) bir rükətdə; "əl-Qəmər (54:55) və "əl-Haqqə (69:52) bir rükətdə; "ət-Tur (52:49) və "əz-Zariyat (51:60) bir rükətdə; "əl-Vaqiə (56:96) və "Nun (68:52) bir rükətdə; "əl-Məaric (70:44) və "ən-Naziat (79:46) bir rükətdə; "əl-Mutəffifin (83:36) və "Əbəsə (80:42) bir rükətdə; "əl-Muddəssir (74:46) və "əl-Muzzəmmil (73:20) bir rükətdə; "əd-Dəhr ("əl-İnsan) (76:31) və "əl-Qiyamə (75:40) bir rükətdə; "ən-Nəbə (78:40)

və “əl-Mursəlat (77:50) bir rükətdə; “əd-Duxan (44:59) və “ət-Təkvir (81:29) bir rükətdə oxunardı[39] (əl-Buxari və Müslim).

Bəzən isə “əl-Bəqərə, “ən-Nisa və “Ali-İmran kimi yeddi uzun surəni bir rükətdə gecə namazında toplayardı və deyərdi: “*Ən yaxşı namaz qiyamı uzun olandır* (Müslim və ət-Təhavi).

“*Əgər o,* **«…məgər bu, ölüləri diriltməyə qadir olmaq demək deyilmi?»** *ayəsini oxusaydı deyərdi: “Subhanəkə, fə bələ” (“Sən pak və nöqsansızsan, bəli”). Əgər o, «Ən Uca olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər de!» (əl-Əla, 1) ayəsini oxusaydı, deyərdi: “Subhanə Rabbiyəl-Əla” ("Uca Rəbbim Pak və nöğsansızdır*)[40] (Əbu Davud və əl-Beyhəqi. Səhih hədisdir).

## YALNIZ FATİHƏNİ OXUMAQLA KİFAYƏTLƏNMƏYƏ İCAZƏ VERİLMƏSİ

---

[39] Mənim fikrimcə, hədisin mənası budur: Hər bir rükətə “əl-Fatihədən sonra bir surə ayırın ki, rükətin onunla kamilləşsin. Bu iş müstəhəbdir, vacib deyildir.

[40] Birinci rəqəm surənin nömrəsi, ikinci rəqəm ayələrin sayını göstərir. Birinci rəqəmlər göstərir ki, Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bu surələri birləşdirəndə heç də Müshəfdə (Quranda) verilən tərtibata riayət etməmişdir.

*Muaz Rəsulullahla -səlləllahu aleyhi və alihi və səlləm- birlikdə şam namazı qılır, bundan sonra qayıdıb öz dostları ilə də namaz qılırmış. Bir gecə gəlib onlarla namaz qıldı. Bəni Səlmə tayfasından olan Səlim adlı bir gənc də onlarla namaza durmuşdu. Namazın çox uzandığını görən gənc çəkilib məscidin bir küncündə ibadətini bitirib bayıra çıxdı, dəvəsinin üzəngisindən yapışaraq yola düşdü. Muaz namazını bitirdikdən sonra ona bu barədə dedilər.*

*O dedi: "Bu, nifaqdır. Rəsulullaha -səlləllahu aleyhi və alihi və səlləm- sənin bu hərəkətin barədə xəbər verməliyəm. Gənc dedi ki, mən də sənin hərəkətin barədə ona xəbər vermək istəyirəm.*

*Səhəri onlar Peyğəmbərin -səlləllahu aleyhi və alihi və səlləm- hüzuruna gəldilər. Muaz o gəncin hərəkəti haqqında Peyğəmbərə -səlləllahu aleyhi və alihi və səlləm- danışdı. Gənc isə dedi: "Ya Rəsulullah! O sənin yanında çox dayanır, sonra bizim yanımıza gələrək uzun namaz qılır. Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- dedi: "Ey Muaz, sən fitnəkarsanmı? Sonra üzünü gəncə tutub dedi: "Sən necə namaz qılırsan, qardaş oğlu? Cavan belə cavab verdi: "Kitabın "əl-Fatihə"sini oxuyuram. Allahdan Cənnət*

*istəyirəm, odun qorxusundan Ondan sığınacaq diləyirəm. Mən nə sənin, nə də Muazın pıçıltı ilə nə dediyinizi bilmirəm. Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- dedi:* "*Mən də, Muaz da elə bunları deyirik. Gənc dedi:* "*Lakin Muaz düşmənin hücum xəbərini alanda hər şeyi başa düşəcək.*

*Həqiqətən də, belə oldu. Bu gənc düşmənlərlə döyüşdə şəhid oldu. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- Muaza dedi: "Mənim və sənin rəqibin gördün nə etdi? Muaz dedi: "Allah onun sözünü düz çıxardı, ya Rəsulullah! Mən yalan danışdım. O gənc şəhid oldu"* (İbn Xuzeymə, əl-Beyhəqi, Əbu Davud, Müslim, Əhməd, əl-Buxari. Etibarlı hədisdir).

## BEŞ NAMAZDA VƏ BAŞQA NAMAZLARDA UCA VƏ SAKİT SƏSLƏ QİRAƏT

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- sübh namazını, məğrib və işa namazlarının ilk iki rükətini uca səslə, zöhr və əsr namazlarını və məğrib namazının üçüncü və işa namazının sonuncu iki rükətini sakit səslə qılardı* (ən-

Nəvəvi keçmiş və sonrakı alimlərin bu məsələdə yekdil olduqlarını demişdir).

Namaza duranlar onun saqqalının tərpənməsi ilə sakit səslə qiraət etdiyini hiss edirdilər (əl-Buxari və Əbu Davud) və bəzən də o, ayəni onlara eşitdirmək üçün bərkdən oxuyardı.

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- cümə, iki bayram* (orucluq və qurban – Z.Q), *yağış yağması və günəş tutulması namazlarını uca səslə qiraət edərdi* (əl-Buxari, Müslim və Əbu Davud).

## GECƏ NAMAZINDA UCA VƏ SAKİT SƏSLƏ QİRAƏT

"*Gecə namazında Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bəzən sakit, bəzən isə uca səslə qiraət edərdi* (əl-Buxari və Müslim).

"*Əgər evdə namaz vaxtı qiraət etsəydi, otaqda olanlar onun səsini eşidərdilər* (Əbu Davud və ət-Tirmizi).

“*Bəzən səsini elə qaldırardı ki, hətta bayırda olanlar da onu eşidərdilər*.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bir dəfə gecə vaxtı Əbu Bəkrin *–radıyallahu anhu-* yanına gəldi və onun sakit səslə, Ömər bin əl-Xəttabın *–radıyallahu anhu-* evinə gələndə isə onun uca səslə namaz qıldığını gördü. Onlar Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* yanına toplaşdıqda dedi:

“*Ya Əbu Bəkr! Yanına gəldim gördüm ki, sakit səslə namaz qılırsan*. *Əbu Bəkr dedi:* “*Mən münacat etdiyimi eşitdirirdim, ya Rəsulullah!*

*Bundan sonra Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- üzünü Ömərə tutub dedi: “Sənin yanına gəldim, uca səslə namaz qıldığını gördüm”. Ömər cavab verdi: “Ya Rəsulullah! Mən mürgünün qarşısını alırdım, şeytanı qovdum”.*

*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- Əbu Bəkrə “sən səsini bir qədər qaldır”, Ömərə isə “səsini bir az aşağı sal” dedi”* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

O həmçinin demişdir: “*Quranı uca səslə oxuyan aşkarda sədəqə verən kimidir. Sakit səslə Quran oxuyan isə gizlincə sədəqə verən kimidir* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

## PEYĞƏMBƏRİN (s.a.v.) NAMAZDA OXUDUQLARI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* beş namazın hər birində ayrıca ayə və ya surə oxuyardı. Aşağıda birincidən başlayaraq hər namaz barədə ayrılıqda müfəssəl danışacağıq:

### 1 – SÜBH (FƏCR) NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* çox zaman Quranın son yeddi uzun surəsini (“Qafdan başlayaraq) oxuyardı.

Bəzən də “əl-Vaqiəni (56:49) və bu növ surələri iki rükətdə oxuyardı (Əhməd, İbn Xuzeymə və əl-Hakim. Səhih hədisdir).

Bəzən isə *“Qaf. Val-Quranul-məcid”* (50:45) və başqa bu kimi surələri birinci iki rükətdə oxuyardı (əl-Buxari və Müslim). Həmçinin qısa surələri (məsələn, “ət-Təkvir) oxuyardı (Müslim və Əbu Davud).

Bir dəfə iki rükətdə bütövlükdə “əz-Zilzalı (99:8) oxudu. Hətta rəvayətçi təəccüblə demişdir: “*Bilmirəm, Rəsulullah buna unudaraq və ya bilərəkdən yol verdi*[41] (Əbu Davud və əl-Beyhəqi. Səhih hədisdir).

“*Bir dəfə səfərdə “əl-Fələq” (113:5) və “ən-Nas” (114:6) surələrini oxumuşdur* (Əbu Davud, İbn Xuzeymə, İbn Bişran, İbn Əbi Şeybə və əl-Hakim. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Uqbə bin Amirə *–radıyallahu anhu-* demişdir: “*Öz namazında iki sığınacaq dilə. Dilədiyin bir sığınacaq hər ikisi kimidir* (Əbu Davud və Əhməd. Səhih hədisdir).

---

[41] Görünür Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bunu bilərəkdən şəriət naminə etmişdir.

“*Bəzən bundan qat-qat artıq sayda ayə oxuyardı. Belə ki, altmış və daha çox sayda ayə oxuyardı* (əl-Buxari və Müslim).

Bəzi rəvayətçilər demişlər: “*Bilmirik bunu o, iki rükətin birində, yoxsa hər ikisində edərdi*. Bəzən “ər-Rum (30:60), bəzən isə “Yasin (36:83) surələrini oxuyardı (ən-Nəsai, Əhməd və əl-Bəzzar. Etibarlı və səhih hədisdir).

Bir dəfə “*sübh namazını Məkkədə qıldı. Namazı “əl-Muminun” (23:118) surəsi ilə açdı, Musanı, Harunu və ya İsanı xatırlatdı. Onu öskürək tutdu və rükəti bitirdi”* (əl-Buxari və Müslim).

*“Bəzən imamlıq edəndə “əs-Saffat” (37:182) surəsini oxuyardı”* (Əhməd, Əbu Yəla və əl-Məqdisi).

“*Cümə günü namaz qılanda “əs-Səcdə” (32:30) surəsini birinci, “əl-İnsan” (“əd-Dəhr”) (76:31) surəsini isə ikinci rükətdə oxuyardı. “Birinci rükətdə qiraəti uzadar, ikincidə isə qısaldardı* (əl-Buxari və Müslim).

## FƏCRİN SÜNNƏ NAMAZINDA QİRAƏT

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Sübh (fəcr) sünnə namazının iki rükətində qiraətini çox yüngülləşdirərdi. (Əhməd. Səhih hədisdir). Hətta Aişə deyərmiş: "*Görəsən, o, Kitabın anasını ("əl-Fatihə"ni) oxudu?"* (əl-Buxari və Müslim).

Bəzən birinci rükətdə: **"Qulu əmənnə billəhi va mə unzilə ileynə..."** *("əl-Bəqərə", 136)-dan başlayaraq ayəni axıra qədər oxuyardı. Başqa bir ayəni:* "**Qul yə əhlil kitəbi təalu ilə kəlimətin səvain bəynənə va bəynəkum...** *("Ali-İmran", 64)-dan başlayıb axıra çatdırardı* (Müslim, İbn Xuzeymə və əl-Hakim).

*Bunun əvəzinə:* "**Fələmmə əhassə İsə minhum əl-kufra...** *("Ali-İmran", 52)-dən başlayaraq ayəni axıra qədər oxuyardı* (Müslim və Əbu Davud).

*Bəzən birinci rükətdə "Qul yə əyyuhəl kəfirun" (109:6) və ikincidə "Qul huvallahu əhəd" (112:4) surələrini oxuyar* (Müslim və Əbu Davud).

*Bir dəfə bir nəfərin birinci surəni (109:6) birinci rükətdə oxuduğunu eşidəndə demişdi: "Bu bəndə öz Rəbbinə inandı". Həmin adam ikinci rükətdə ikinci surəni (112:4) oxuduqda isə "Bu bəndə öz Rəbbini tanıdı" demişdir* (ət-

Təhavi, İbn Hibban, İbn Bişran və əl-Hafiz. Etibarlı hədisdir).

## 2 – ZÖHR NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* birinci iki rükətdə "əl-Fatihəni və başqa iki – birincidə uzun, ikincidə isə qısa surə oxuyardı (əl-Buxari və Müslim).

Bəzən zöhr namazını uzadardı. O qədər uzadardı ki, iqamə verildikdən sonra biri Bəqiə gedib işini görüb evinə qayıdar, sonra dəstəmaz alaraq məscidə gələrdi. Bu vaxt Rəsulullah *-səlləllahu aleyhi və alihi və səlləm-* hələ birinci rükətdə olardı (əl-Buxari və Müslim).

"*Elə zənn edirdilər ki, Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bununla istəyir ki, insanlar birinci rükətə çatsınlar* (Əbu Davud və İbn Xuzeymə. Səhih hədisdir).

"*Hər bir əvvəlki iki rükətdə "əs-Səcdə" (32:30) "əl-Fatihə" ilə birlikdə oxunan qədər 30 ayə oxuyardı* (Əhməd və Müslim).

“*Bəzən isə “Vəs-Səma vat-Tariq” (86:17) və “Vəs-Səma zatil-büruc” (85:22) və “Vəl-Leyli izə yəğşə” (92:21) və bu kimi surələri oxuyardı* (Əbu Davud, ət-Tirmizi və İbn Xuzeymə. Səhih hədisdir).

“*Bəzən də “İzəs-səma inşəqqat” (84:25) kimi surələri oxuyardı* (İbn Xuzeymə. Səhih hədisdir).

“*Onun zöhr və əsr namazlarında qiraət etdiyini adamlar saqqalının tərpənməsi ilə hiss edərdilər* (əl-Buxari və Əbu Davud).

## PEYĞƏMBƏRİN (s.a.v.) SON İKİ RÜKƏTDƏ ƏL-FATİHƏDƏN SONRA OXUDUĞU AYƏLƏR

“*Son iki rükəti birinici iki rükətdən yarıya qədər, on beş ayəyə qədər qısaldardı* [42] (Əhməd və Müslim).

“*Bəzən hətta yalnız bir “əl-Fatihə” ilə kifayətlənərdi* (əl-Buxari və Müslim).

“*Bəzən ayəni (bərkdən oxuyub) onlara eşitdirərdi”* (əl-Buxari və Müslim).

[42] Hədisdən göründüyü kimi, son iki rükətdə "əl-Fatihə"yə əlavə etmək Sünnəyə uyğundur. Əshabələrdən əksəriyyəti bununla razılaş-mışlar.

“*Onun “Səbbih ismi Rabbikəl-əla " (87:19) və "Həl ətəkə hədisul-Ğaşiyə" (88:26) surələrinin oxumasını eşidərdilər* (İbn Xuzeymə "Səhih" 1/67/2 və əz-Ziya əl-Məqdisi "əl-Muxtarə". Səhih istinadı vardır).

“*Bəzən də “Vəs-Səma zatil-büruc” (85:22), “Vəs-Səma vət-Tariq” (86:17) və başqa bu kimi surələri oxuyardı* (əl-Buxari “Cuzul-qiraəti və ət-Tirmizi. Səhih hədisdir).

“*Bəzənsə “Vəl-leyli izə yəğşə” (92:21) və başqa bu kimi surələri oxuyardı* (Müslim və ət-Təyalisi).

## 3 – ƏSR NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* birinci iki rükətdə “əl-Fatihəni və birinci ikincidən daha uzun olmaqla iki (hər rükətdə bir) surə oxuyardı (əl-Buxari və Müslim). Elə zənn edirdilər ki, insanların birinci rükətə çatması üçün o, belə edir (Əbu Davud. Səhih istinadla və İbn Xuzeymə).

“*Onların hər birində on beş ayə qədər oxuyardı, bu zöhrün birinci iki rükətində oxunanın yarısı qədər idi*. “*Son*

*iki rükəti birinci ikisindən yarıya qədər qısa oxuyardı* (Əhməd və Müslim).

“*Bu namazda “əl-Fatihə”ni oxuyardı* (əl-Buxari və Müslim).

“*Bəzən də ayəni bərkdən oxuyub namaz qılanlara eşitdirərdi* (əl-Buxari və Müslim).

Zöhr namazında adını çəkdiyimiz surələri də bu namazda oxuyardı.

## 4 – MƏĞRİB NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bəzən qısa surələri oxuyardı (əl-Buxari və Müslim).

Hətta “*onunla birgə namaz qılanlardan biri salam verdikdən (namaz bitdikdən) sonra dönüb baxarsa, oxları qoyduğu yeri görərdi”* (ən-Nəsai və Əhməd. Səhih hədisdir).

“*Səfərdə "Vət-tini vəz-zeytun" (95:8) surəsini ikinci rükətdə oxuyardı* (ət-Təyalisi və Əhməd. Səhih hədisdir).

“*Bəzən də uzun və orta surələri oxuyardı. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- namazın axırında bəzi*

*vaxtlar “Əlləzinə kəfəru və saddu ən səbil-illəhi” (47:38)* – (İbn Xuzeymə 1/166/2, ət-Təbərani və əl-Məqdisi. Səhih hədisdir), *bəzən “ət-Tur” (52:49)* - (əl-Buxari və Müslim) *və bəzən də “əl-Mursəlat” (77:50) surələrini oxuyardı* (əl-Buxari və Müslim).

“*Bəzən də iki ən uzun surənin biri olan “əl-Əraf” (7:206) surəsini iki rükətdə oxuyardı* (əl-Buxari, Əbu Davud, İbn Xuzeymə (1/68/1), Əhməd, əs-Sərrac və əl-Müxlis).

“*Bəzən isə iki rükətdə “əl-Ənfal” (8:76) surəsini oxuyardı* (ət-Təbərani “əl-Kəbir. Səhih hədisdir).

## MƏĞRİBİN SÜNNƏ NAMAZINDA QİRAƏT

“Məğrib sünnə namazında *“Qul yə əyyuhəl kəfirun”* (109:6) və *“Qul huvallahu əhəd”* (112:4) surələrini oxuyardı.

## 5 -İŞA NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sălləm-* birinci iki rükətdə orta həcmli surələri oxuyardı (ən-Nəsai və

Əhməd. Səhih hədisdir). Bəzən *"Vəş-şəmsi vəd-duhahə"* (91:15) və ona oxşar surələri oxuyardı (Əhməd və ət-Tirmizi. Etibarlı hədisdir).

"*Bəzən də "İzəs-Səməu inşəqqat" (84:25) surəsini oxuyub onunla da səcdə edərdi* (əl-Buxari, Müslim və ən-Nəsai).

"*Bir dəfə səfər vaxtı "Vət-tini vəz-Zeytun" (95:8) surəsini birinci rükətdə oxudu* (əl-Buxari, Müslim və ən-Nəsai).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* şam (fərz) namazını uzatmağı yasaq etmişdir. "*Bir dəfə Muaz bin Cəbəl öz adamları ilə birlikdə axşam namazı qılırmış. O, namazı çox uzadır. Namaz qılanlardan biri namazdan çıxaraq ayrıca qılır. Muaza bu haqda xəbər verilir. Muaz onu münafiq (ikiüzlü) adlandırır. Kişi Peyğəmbərin -səlləllahu aleyhi və alihi və səlləm- yanına gedib Muazın dediklərini ona çatdırır. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- deyir: "Muaz, məgər sən fitnəkarsanmı? Əgər imamlıq etsən, onda yalnız "Vəş-Şəmsi vəd-Duhahə" (91:15), "Səbbih ismi Rabbikə əla" (87:19), "İqra bismi Rabbikəl-ləzi xaləq" (96:19) və "Vəl-Leyli izə yəğşə" (92:21) surələrini oxuyarsan. Unutma ki, sənin arxanda yaşlı, xəstə və ehtiyacı*

*olanlar namaz qılırlar”* (əl-Buxari, Müslim və ən-Nəsai "əl-Ərva": 295).

## 6 - GECƏ NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bəzən qiraəti qısaldar, bəzən də uzadardı, bəzən hətta çox uzadarmış. Abdullah bin Məsud *–radıyallahu anhu-* bu barədə demişdir: “*Bir gecə Peyğəmbərlə -səlləllahu aleyhi və alihi və səlləm- namaz qılırdım. O qədər ayaq üstə durdu ki, hətta ağlıma bir pis fikir gəldi. Soruşdular: “Nə pis fikir?” Dedi: “Peyğəmbəri -səlləllahu aleyhi və alihi və səlləm- ayaq üstə qoyaraq mən oturmaq istədim.*

Huzeyfə bin əl-Yəmən demişdir: “*Bir gecə Peyğəmbərlə -səlləllahu aleyhi və alihi və səlləm- namaz qılırdım. O, namaz vaxtı "əl-Bəqərə"ni başlayanda öz-özümə dedim ki, yəqin ki, iki rükətlə kifayətlənəcək. Lakin belə olmadı. Yenə öz-özümə dedim ki, yəqin bu surə ilə rüku edəcəkdir. O isə “ən-Nisa”nı başladı, onu qiraət edib “Ali-*

*İmran"a keçdi,*[43] *onu da oxudu. O, ayələri aramla oxuyurdu. Əgər bir ayədə təsbih (Allaha tərif) vardısa təsbih edərdi, bir dilək olurdusa onu dilərdi, qorunacaqşey zikr olunurdusa onun qorunmasını diləyərdi, yalnız bundan sonra rüku etdi..."* (Müslim və ən-Nəsai).

"*Bir dəfə gecə namazında yeddi uzun surəni*[44] *oxudu* (Əbu Yəla, əl-Hakim, əz-Zəhəbi bu hədisin səhih olduğunu sübut etmişdir).

"*Bəzən hər rükətdə bu surələrdən (uzun surələr) birini oxuyardı* (Əbu Davud və ən-Nəsai. Səhih istinadlı hədis).

Onun bir gecədə bütöv Quranı oxuması haqda dəlil bilinmir. Əksinə, bu barədə ondan soruşan Abdullah bin Amra razılıq verməyərək demişdir: "*Quranı hər ay oxu*. Abdullah bin Amr deyəndə ki, mən bunu asanlıqla edərəm, onda demişdir: "*Onda onu iyirmi günə oxu*. Abdullah bin Amr yenə də bildirmişdir ki, bunu da asanlıqla edər. O son

---

[43] Hədisdən göründüyü kimi, "ən-Nisa surəsi "Ali-İmrandan qabaq qeyd edilir. Bu bir daha sübut edir ki, Osman müshəfinin (Quranının) surələrinin sıra düzülüşünə mültəzim olmaq vacib deyildir.

[44] Yeddi uzun surə bunlardır: "əl-Bəqərə, "Ali-İmran, "ən-Nisa, "əl-Maidə, "əl-Ənam, "əl-Əraf və "ət-Tövbə.

olaraq deyir: “*Quranı yeddi gün ərzində oxu, daha bundan da tez olmaz* (əl-Buxari və Müslim).

“*Sonradan ona beş günə oxumaq icazəsini verdi* (ən-Nəsai və ət-Tirmizi. Səhih hədisdir).

“*Daha sonra ona üç günə oxumaq icazəsini verdi* (əl-Buxari və Əhməd).

“*Bu müddətdən az vaxtda oxumağı qadağan etmişdi* (əd-Darimi və Səid bin Məsud, “Sünən əsəri. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* özünün bu qadağasını Abdullah bin Amra dediyi bu sözlərlə əsaslandırmışdır: “*Quranı üç gündən az bir müddətə oxuyub qurtaran onu başa düşə bilməz* (Əhməd. Səhih istinadlı hədisdir).

Başqa ləfzdə deyilir: “*Kim Quranı üç gündən tez vaxtda oxusa, onu başa düşə bilməz* (əd-Darimi və ət-Tirmizi. Səhih hədisdir).

O həmçinin demişdir: “*Hər bir bəndənin bir həvəs dövrü vardır. O da ya Sünnə üçün, ya da bidət üçün olur. Kimin həvəs dövrü sünnədədir o artıq haqq yolunu tapmışdır, kimin həvəs dövrü bidətdədir o da artıq həlak olmuşdur*

(Əhməd və İbn Hibban. “Səhih əsərində). “*Buna görə də Peyğəmbər -sәllәllahu aleyhi və alihi və səlləm- Quranı üç gündən tez oxumazdı* (İbn Səd 1/386, Əbu əş-Şeyx “Əxlaqun-Nəbi 271).

Peyğəmbər *-sәllәllahu aleyhi və alihi və səlləm-* deyərdi: “*Bir gecəyə namazda iki yüz ayə oxuyanlar ən sədaqətli möminlərdəndir”* (əd-Darimi, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

“*Hər gecə “əl-İsra” (17:111) və “əz-Zumər” (39:75) surələrini oxuyardı* (Əhməd və İbn Nasr. Səhih hədisdir).

O deyərmiş: “*Bir gecə namazında yüz ayə oxuyan şəxs qafillər sırasına düşməz* (əd-Darimi, əz-Zəhəbi və əl-Hakim. Səhih hədisdir).

“*Bəzən hər rükətdə əlli və daha artıq ayə oxuyardı* (əl-Buxari və Əbu Davud) *və bəzən də “əl-Muzzəmmil” (73:20) surəsi qədər oxuyardı”* (Əhməd və Əbu Davud. Səhih hədisdir).

“*Peyğəmbər -sələllahu aleyhi və alihi və səlləm- nadir hallarda bütün gecəni*[45] *bütövlükdə namaza sərf edərdi* (Müslim və Əbu Davud).

“*Abdullah bin Xəbbab bin əl-Ərt Rəsulullahla -səlləllahu aleyhi və alihi və səlləm- birlikdə ayı gördülər. Həmən gecəni Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bütünlüklə namaza həsr etdi. Sübh açılanda namazını bitirdi. İbn Xəbbab ona deyir:* “*Ya Rəsulullah! Atam-anam sənə qurban. Sən bütün gecəni namaz qıldın. Mən belə etdiyini heç görməmişdim”*. O belə cavab verir: “*Bəli, bu rəğbət və qorxu namazıdır. Mən Qüdrət və Cəlal sahibi olan Rəbbimə üç istəklə müraciət etdim. O mənə ikisini verdi, birinə isə razı olmadı. Rəbbimdən istədim ki, bizi də bizdən qabaqkı millətlər kimi həlak etməsin. Buna razı oldu. Qüdrət və Cəlal sahibi olan Rəbbimdən düşmənlərimizə bizim üzərimizdə zəfər çalmağa imkan verməməyi rica etdim. Buna da razı oldu. Rəbbimdən bizi ayrı-ayrı dəstələrə parçalamamağı və aramızda təfriqə yaratmamağı istədim.*

[45] Bu və başqa bu məzmunlu hədislər bütün gecəni həmişə və çox zaman yuxusuz qalmağı bəyənmir (məkruh edir), çünki bu Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* sünnəsinə müxalifdir. Əgər bütün gecələri yuxusuz keçirtmək məqbul olsaydı Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* belə edərdi. Ən xeyirli yol Məhəmmədin *-səlləllahu aleyhi və alihi və səlləm-* hidayət yoludur.

*Buna razı olmadı”* (ən-Nəsai, Əhməd və ət-Təbərani (1/187/2) və ət-Tirmizi. Səhih hədisdir).

“*Bir gecə o, sübhə qədər namaz qılaraq* **«Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət, hikmət sahibisən!»** (əl-Maidə, 118) *ayəsini təkrar etmişdir. Bu ayə ilə o rüku, səcdə və dua edirdi. Sübh açılanda Əbu Zər –radıyallahu anhu- ondan soruşur:* “*Ya Rəsulullah! Bu ayəni səhərə qədər oxudun, onunla rüku, səcdə və dua etdin. Allah sənə bütün Quranı öyrətmişdir. Əgər biz belə etmiş olsaq, bizə irad tutarsanmı? Peyğəmbər -səlləllahu aleyhi və alihi və sələm- deyir:* “*Mən öz Qüdrət və Cəlal sahibi olan Rəbbimdən ümmətimə şəfaət (vasitəçilik) dilədim. Ona razı oldu. Allaha şərik qoşmayan inşaalah buna (şəfaətimə) nail olacaq* (ən-Nəsai, İbn Xuzeymə (1/70/1), Əhməd, İbn Nasr və əl-Hakim. əz-Zəhəbi onun səhih hədis olduğunu sübut etmişdir).

“*Bir nəfər deyir:* “*Ya Rəsulullah! Mənim bir qonşum var. Hər gecə durur və yalnız* “*Qul huvallahu əhəd (112:4) –* “*De ki, Allah təkdir surəsini təkrarlayır, dəfələrlə oxuyur. Sanki, bu adam bunu az (bir) əməl kimi görürdü. Peyğəmbər -səlləllahu aleyhi və alihi və sələm- deyir:* “*Allaha and*

*olsun! Bu (surə) Quranın üçdə birinə bərabərdir* (Əhməd və əl-Buxari).

## 7 - VİTR NAMAZI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sələm-* bu namaz vaxtı birinci rükətdə “Səbbih ismə Rabbikəl-əla (87:19), ikincidə “Qul yə əyyuhəl kəfirun (109:6), üçüncüdə “Qul huvallahu əhəd (112:4) surələrini oxuyardı (ən-Nəsai və Əhməd).

“*Bəzən onlara “əl-Fələq” (113:5) və “ən-Nas” (114:6) surələrini də əlavə edirdi* (ət-Tirmizi, Əbul Abbas əl-Əsəm “Hədis əsəri 2-ci cild. 17 saylı hədis. əl-Hakim və əz-Zəhəbi bunun səhih olduğunu sübut etmişlər).

*“Bir dəfə üçüncü rükətdə “ən-Nisa” surəsindən (4:176) yüz ayə oxudu” (ən-Nəsai və Əhməd. Səhih hədisdir). Vitrdən sonrakı rükətlərdə isə “əz-Zilzal” (99:8) və “əl-Kafirun” (109:6) surələrini oxuyardı*[46] (Əhməd, İbn Nasr, ət-

---

[46] Bu iki rükət Müslimin “Səhih əsərində və başqa əsərlərdə sübuta yetirilmişdir. Onlar Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* bu fikrinə ziddir: “Öz namazınızın sonunu gecə vaxtı vitr olaraq (tək sayda) başa çatdırın. Alimlər bu iki hədisi

Təhavi (1/2/202), İbn Xuzeymə və İbn Hibban. Etibarlı və səhih istinadlı hədisdir).

## 8 - CÜMƏ NAMAZI

Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- cümə namazında bəzən birinci rükətdə "əl-Cumuə (62:11), o birisində isə "əl-Munafiqun surələrini oxuyardı. Bəzən də bunun əvəzində "əl-Ğaşiyə (88:26) surəsini oxuyardı (Müslim, Əbu Davud).

*Bəzən isə birincidə "əl-Əla" (87:19) və ikincidə "əl-Ğaşiyə" (88:26) surələrini oxuyardı* (Müslim və Əbu Davud).

## 9 - BAYRAM NAMAZLARI

---

bir araya gətirməkdə müxtəlif fikirdədirlər. Ancaq mən onlardan hansının üstün olduğunu deyə bilmərəm. Ona görə də peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm*- ikinci hədisinə görə bu iki rükəti qılmamaq daha ehtiyatlı olardı – əl-Albani.)

Peyğəmbər *-sallallahu aleyhi və alihi və səlləm-* bəzən birinci rükətdə “əl-Əla, o birində isə “əl-Ğaşiyə surələrini oxuyardı (Müslim və Əbu Davud). Bəzən də bu namazlarda “Qaf. Val Quranil Məcid (50:45) və “İqtərabətis-saətu (54:55) surələrini oxuyardı (Müslim və Əbu Davud).

## 10 - CƏNAZƏ NAMAZI

Bu namazda “əl-Fatihənin və başqa bir surənin[47] oxunması və birinci təkbirdən sonra sakit səslə qiraət Sünnəyə uyğundur. (ən-Nəsai və ət-Təhavi. Səhih hədisdir).

## AVAZLA QİRAƏT VƏ ONUNLA SƏSİN GÖZƏLLƏŞDİRİLMƏSİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Allahın əmrini yerinə yetirərək Quranı

[47] Bu fikri İmam əş-Şafii, Əhməd və İshaq irəli sürür.

avazla - nə sürətlə, nə də ki çox yavaş, aramla oxuyardı. "*Onun qiraətində hər bir hərf (səs) aydın şəkildə deyilərdi* (İbn əl-Mübarək, Əbu Davud, Əhməd. Səhih hədisdir).

*O surəni elə avazla oxuyardı ki, əslində olduğundan daha uzun görünərdi* (Müslim və Malik).

O deyərdi: "*Quranı oxuyana deyilir: "Aramla və dünyada oxuduğun kimi avazla oxu. Sənin mənzilin ən son oxuduğun ayənin dərəcəsindədir* (Əbu Davud və ət-Tirmizi. Səhih hədisdir).

*"Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- avazla oxuyanda mədd (uzun) hərfləri "Bismilləhi", "ər-Rahmən" və "ər-Rəhim" ifadələrində qiraəti uzadardı*(əl-Buxari və Əbu Davud).

Həmçinin "Nadid və başqalarında da qiraəti uzadardı (əl-Buxari, "Əfalul ibad" əsəri. Səhih hədisdir).

Artıq qeyd etdiyimiz kimi ayələrin başında dayanardı, oxuduğunu təkrarlayardı, nəqarət edərdi.[48] "*Fəth günü dəvənin belində "əl-Fəth" surəsini (48:29) mülayim səslə,*

---

[48] əl-Hafiz (AAA) formulunu şərh edərək demişdir ki, bu üç uzun əlifdir (a-dır).

*avazla oxumuşdu* (əl-Buxari, Əbu Davud, əd-Darimi, əl-Hakim və Təmam ər-Razi. Səhih hədisdir).

Quranı gözəl səslə oxumağı əmr edərək deyərdi: "*Quranı səsinizlə bəzəyin. Həqiqətən gözəl səs Quranın gözəlliyini daha da artırır* (əl-Buxari, Əbu Davud, əd-Darimi, əl-Hakim və Təmam ər-Razi. İki səhih sənədlə).

O həmçinin deyərdi: "*Quranı ən gözəl səslə oxuyan, onu dinləyərkən Allahdan qorxduğunu hiss etdiyiniz kəsdir* (Səhih hədisdir. Onu İbn əl-Mübarək "Zühd (162/1) və "əl-Kəvakib (575) əsərlərində, əd-Darimi, İbn Nasr, ət-Təbərani, Əbu Nəim "Əxbərul İsbəhan və əz-Ziya "əl-Muxtarə əsərlərində verirlər).

Quranı nəğmə avazı ilə oxumağı əmr edib demişdir: "*Allahın kitabını öyrənin, onu mənimsəyin, ona sədaqətli olun, onu avazla (nəğmə ilə) oxuyun. Allaha and olsun o, buxovundan qurtulan dəvədən daha artıq azadlığa can atır* (əd-Darimi, Əhməd. Səhih sənədlə).

O həmçinin demişdir: "*Quranı nəğməli avazla oxumayan bizdən deyildir* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və salləm-* demişdir: "*Allah Peyğəmbərin gözəl səslə ucadan oxuduğu Qurandan gözəl heç nəyi eşitməz* (əl-Buxari, Müslim, ət-Təhavi və İbn Mundih "ət-Tovhid" (81/1). O, Əbu Musa əl-Əşariyə *–radıyallahu anhu-* demişdir: "*Kaş ki, görəydin dünən mən sənin qiraətinə necə qulaq asırdım. Sənə lap Davuda verilən səsdən verilib"* (Əbu Musa buna cavab olaraq demişdir: "Sənin orada olduğunu bilsəydim, sənin üçün bu qiraəti daha yaxşı səslə oxuyardım).

## İMAMA KÖMƏK ETMƏK

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və salləm-* Sünnəsi qiraət zamanı çaşmış imama kömək etməyə icazə verir.

Bir dəfə namaz vaxtı qiraət edərkən çaşdı. Namazı başa çatdırıb Ubeyydən soruşdu: "Sən bizimlə namaz qıldın?. O "bəli deyəndə bir daha soruşdu: "Onda bəs mənə kömək etməyə (unutduğumu mənə xatırlamağa) sənə nə mane olurdu?

## ŞEYTAN VƏSVƏSƏSİNİ DƏF ETMƏK ÜÇÜN NAMAZDA İSTİAZƏ VƏ TÜPÜRMƏK

*"Osman bin Əbu əl-As –radıyallahu anhu- bir dəfə ondan soruşdu: "Ya Rəsulullah! Şeytan mənim namazıma və qiraətimə mane olur, məni çaşdırır". Rəsulullah -səlləllahu aleyhi və alihi və səlləm- dedi: !O Şeytana deyirlər: "Xinzab!" Əgər onu hiss etsən, Allahdan yardım dilə ("Əuzu billəhi minəş-şeytanir-racim - de") və sol tərəfə üç dəfə tüpür". Əbu əl-As demişdir: "Belə etdim. Allah şeytanı məndən uzaqlaşdırdı* (Müslim və Əhməd).

## RÜKU

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* qiraəti bitirdikdə bir qədər sükut edərdi, "Açılış təkbirində olduğu kimi, əllərini yuxarı qaldırar, "Allahu əkbər deyib rüku edərdi (Əbu Davud, əl-Hakim, əz-Zəhəbi, əl-Buxari və Müslim. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bunu "namazı düzgün qılmayana əmr edərək demişdir: "*Allahın əmr etdiyi kimi tam dəstamaz alınmadan, "Allahu əkbər"*

*deyilmədən, O mədh edilmədən, həmdü-səna oxunmadan, Allahın öyrətdiyi Qurandan bacardığı surələri oxumadan qılınan namaz tam hesab edilməz. Bütün bunlardan sonra namaz qılan rüku edir (əlləri ilə dizlərini tutaraq belini əyir). Rükuda bütün oynaqları öz yerini tutub əzələləri boşalana qədər durur* (Əbu Davud, ən-Nəsai, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

## RÜKUNUN İCRA TƏRZİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* əllərini dizlərinə qoyardı və belə etməyi əmr edərdi (əl-Buxari və Əbu Davud).

Yuxarıda deyildiyi kimi, “namazı düzgün qılmayana da belə əmr etməyi əmr etmişdi (əl-Buxari və Əbu Davud).

“*Əllərini diz qapaqlarının üstündə elə yerləşdirərdi ki, elə bil onları tutmuşdur* (əl-Buxari və Müslim), “*Barmaqlarını bir-birindən aralayardı* (əl-Hakim, əz-Zəhəbi və ət-Təyalisi. Səhih hədisdir. Əbu Davud, “Səhih səh.809).

“Namazı düzgün qılmayana bunu etməyi əmr edərək demişdir: “*Rüku edəndə əlinin içini diz qapaqlarının üstünə*

*qoy, barmaqlarını bir-birindən ayır, bədənin hər bir üzvü öz yerini alana qədər bu cür dayan* (İbn Xuzeymə və İbn Hibban. "Səhih" əsəri).

Rükuda "*əlləri yana salmağa icazə verməzdi və bu (Sünnəyə) uyğun deyildir* (ət-Tirmizi və İbn Xuzeymə. Səhih hədisdir).

"*Rüku vaxtı əyilərək belini düz tutardı* (əl-Beyhəqi və ət-Tirmizi. Səhih hədisdir).

"*Bu vəziyyətdə onun belinə su tökülsəydi belə, su axmazdı* (ət-Təbərani, "əl-Kəbir və "əs-Səğir əsərləri; Abdullah bin Əhməd, "Zəvaidul-musnəd" və İbn Macə).

"*Əgər rüku edirsənsə, əllərini dizinin üstünə qoy, belini düzəlt və rükuya dur* (Əhməd və Əbu Davud. Səhih istinadlı hədisdir).

"*Rüku vaxtı o, başını nə çox aşağı əyərdi, nə də çox qaldırardı, orta vəziyyətdə tutardı* (Əbu Davud, əl-Buxari, Müslim və Əbu Uvanə. Səhih hədisdir).

## RÜKU VAXTI RAHATLIĞIN ZƏRURİLİYİ

“O rüku vaxtı özünü çox rahat hiss edərdi.

“Namazı düzgün qılmayana da bunu əmr etmişdi. Bu barədə keçən fəsildə danışmışıq.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Rüku və səcdəni tam edin. Allaha and olsun, mən sizin rükunuzu, səcdənizi mənim arxamda olsanız da görürəm* (bu peyğəmbərə xas möcüzələrdəndir – red.).[49]

“*Birisi namaz vaxtı rükunu tamamlamadan səcdəni də tez-tez edərdi. Bunu görən Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- dedi: “Bu adam bu vəziyyətdə ölərsə, deməli, Məhəmməd ümmətindən olan kimi ölmədi”. Namazda elə tez-tez səcdə edərdi ki, sanki qarğa qanı dimdikləyir. Rükunu tamamlamayanın, səcdəni tez-tez edənin məsəli bir-iki xurma yeyən ac adam kimidir. Onların heç bir xeyri olmaz* (Əbu Yəla, əl-Beyhəqi, ət-Təbərani, İbn Asəakir və İbn Xuzeymə).

Əbu Hureyrə *–radıyallahu anhu-* demişdir: “*Peyğəmbərim -səlləllahu aleyhi və alihi və səlləm- mənə namazda xoruz kimi dimdik vurmağı, tülkü kimi ətrafı*

---

[49] Bu rəvayət Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* möcüzələrindən birinə dəlalət edir. Bu yalnız namaz vaxtına aiddir.

*pusmağı, meymun kimi oturmağı qadağan etmişdir* (ət-Təyalisi, Əhməd, İbn Əbi Şeybə. Etibarlı hədisdir).

O həmçinin demişdir: "*Ən pis oğru öz namazından oğurlayandır". Ondan soruşurlar: "Ya Rəsulullah, adam öz namazından necə oğurlaya bilər?" O deyir: "Öz rükusunu və səcdəsini tamamlamayanda* (İbn Əbi Şeybə, ət-Təbərani, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sələm-* namaz vaxtı rüku və səcdəni düzgün icra etməyən bir adamı görür. Namazdan sonra deyir: "*Ey müsəlman camaatı, rükunu və səcdəni düzgün icra etməyənin namazı qəbul edilməz* (İbn Əbi Şeybə, İbn Macə və Əhməd. Səhih hədisdir).

Başqa hədisdə deyilir: "*Rüku və səcdəni düz icra etməyənin namazı qəbul olunmaz* (Əbu Uvanə, Əbu Davud, əs-Səməhmi və əd-Dəraqutni. Səhih hədisdir).

## RÜKU ZİKRLƏRİ

R ükuda müxtəlif müxtəlif növ zikrlər və dualar

oxuyardı. Bəzən birini, bəzən də o birisini seçərdi.

1 – (( سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ )) (üç dəfə) **«Subhanə rabbiyə-l-azıм»** [*Əzəmət sahibi olan Rəbbim pak və nöqsansızdır*] (Əhməd, Əbu Davud, İbn Macə, əd-Dəraqutni, ət-Təhavi, əl-Bəzzar, İbn Xuzeymə və ət-Təbərani "əl-Kəbir əsərində).

Bəzən bu ifadəni daha çox təkrar edərdi.[50] Bir dəfə gecə namazında bu ifadəni o qədər təkrar etdi ki, rüku müddəti qiyam müddətinə yaxınlaşdı. Bu zaman o, üç uzun surə ("əl-Bəqərə, "ən-Nisa və "Ali-İmran) oxudu və gecə namazında olduğu kimi dua və istiğfar da etdi.

2 – (( سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ وَبِحَمْدِهِ )) (üç dəfə) **«Subhanə rabbiyə-l-azıм bihəмdihi»** [*Əzəmət sahibi olan pak və nöqsansız Rəbbimə həmd ilə*] (Əbu Davud, əd-Dəraqutni, Əhməd, Təbərani və əl-Beyhəqi).

3 – (( سُبُّوحٌ ، قُدُّوسٌ ، رَبُّ الْمَلاَئِكَةِ وَالرُّوحِ )) - **«Subbuhun, quddusun, rabbu-l-мələ'ікəті va-r-ruh»** [*Çox təsbih*

[50] Bu hədisdən aydın olur ki, Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- qiyam, rüku və səcdə müddətini eyni bərabərdə edərdi.

*olunan və ÷ığ Müqəddəs olan, mələklərin və Ruhun (Cəbrailin) Rəbbi*][51] (Müslim və Əbu Uvanə).

4 – (( سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ ، اللَّهُمَّ اغْفِرْ لِي )) - **«Subhanəкə-l-lahuммə və bihəмdiкə Allahuммə-ğfirli»** [*Pak və nöqsansız Allahım, Səni təsbih edirik, həmd Sənə məxsusdur. Allahım məni bağışla*]. Bu sözlərlə rüku və səcdəsini uzadır, Quranın tələbinə görə bunları zikr edərdi[52] (əl-Buxari və Müslim).

5 - (( اللَّهُمَّ لَكَ رَكَعْتُ، وَبِكَ آمَنْتُ، وَلَكَ أَسْلَمْتُ، أَنْتَ رَبِّي، خَشَعَ لَكَ سَمْعِي، وَبَصَرِي، وَمُخِّي، وَعَظْمِي، وَعَصَبِي، وَمَا اسْتَقَلَّ بِهِ قَدَمِي لله رَبِّ الْعَالَمِينَ)) -

**«Allahuммə ləкə raкa‘тu, va biкə əмənтu, va ləкə əsləмтu, əнтə rabbi, xaşə‘a ləкə səм‘i, va bəsari, va мuxxi, va azмi va asabi, va мə əsтəqallə bihi**

---

[51] “*Subbuhun, Quddusun* - Əbu İshaq yazır: “*Subbuh* hər hansı bir qəbahətdən təmiz, ülvi olandır. “*Quddus* – müqəddəs, mübarək, saf, pak olandır.

[52] Quranın tələbinə görə ifadəsinin mənası budur ki, onun göstə-rişlərinə əməl edərdi. İzzət və Cəlalət sahibinin bu buyruğuna mültəzim olardı: “**Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!** (ən-Nəsr, 3).

**qadəмi lilləhi rabbil aləмin»** [*Allahım Sənə rüku etdim, Sənə iman gətirdim və Sənə təslim oldum. Sən mənim Rəbbimsən. Qulağım, gözüm, beynim, sümüklərim, əsəblərim və ayaqlarımın üstündə qərar tutan hər şey aləmlərin Rəbbi olan Allahım Sənə tabe oldu*] (Müslim, Əbu Uvanə, ət-Təhavi və əd-Dəraqutni).

6 – (( اللّهُمَّ لكَ ركَعْتُ، وَبِكَ آمَنْتُ، ولَكَ أسْلَمْتُ، وَ علَيكَ **توَكَّلْتُ** أنْتَ ربِّي، خَشَعَ سَمْعِي، بَصَرِي، وَ **دَمِي** وَ **لحْمِي** وَعَظْمِي، وَعَصَبِي، وَمَا اسْتَقَلَّ بِهِ قَدَمِي للهِ رَبِّ وَ الْعَالَمِينَ))

**«Allahuммə ləкə raка‘тu, va bікə əмənтu, va ləкə əsləмтu, va aleyкə тəvəккəlтu, ənтə rabbi, xaşə‘a, səм‘i, va bəsari, va dəмi, va ləhмi, va azмi va asabi lilləhi rabbil aləмin»** [*Allahım Sənə rüku etdim, Sənə iman gətirdim və Sənə təslim oldum. Sənə təvəkkül etdim, Sən mənim Rəbbimsən. Qulağım, gözüm, qanım, ətim, sümüklərim, əsəblərim və ayaqlarımın üstündə qərar tutan hər şey aləmlərin Rəbbi olan Allaha tabe oldu*] (ən-Nəsai. Səhih istinadlı hədisdir).

7 – (( سُبْحَانَ ذِي الْجَبَرُوتِ، وَالْمَلَكُوتِ، وَالْكِبْرِيَاءِ، وَالْعَظَمَةِ )) - **«Subhanə zi-l-cəbəruтi, va-l-мələкuтi, va-l-кibriyə‘i, va-l-azəмəтi»** [*Qüdrət, hökmranlıq, böyüklük və əzəmət Sahibi olan Allahım pak və nöqsansızdır*].[53] Bunu gecə namazında deyərdi (Əbu Davud və ən-Nəsai. Səhih hədisdir).[54]

## RÜKUNUN UZADILMASI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* rükunu, rükudan sonra qiyamı, səcdəni və iki səcdə arası oturuşu bir-birinə təqribən bərabər bir müddətdə icra edərdi *(əl-Buxari və Müslim)*.

## RÜKUDA QURAN OXUMAĞI YASAQ ETMƏSİ

[53] "*Cəbərut* - cəbr sözündən olub əzəmət, cəlal, qüdrət deməkdir. "*Mələkut* - Məlik sözündən olub hökmranlıq, səltənət və sərəncam mənasını verir. Yəni ən ali qüdrət və sərəncam sahibi Allah təala.

[54] Rəsulullah *-səlləllahu aleyhi və alihi və səlləm-* onları bir rükndə toplamazdı. Bir dəfə birini, başqa vaxt o birini zikr edərdi. İnşaallah, bu daha düzdür.

Rüku və səcdədə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Quran oxumağı yasaq edərək demişdir: "*Mən rüku və səcdədə Quran oxumağı qadağan etdim. Rükuda siz Allaha təzim edin, səcdədə çoxlu dua edin. Belə etsəniz cavab almağa layiqsiniz* (Müslim və Əbu Uvanə).

## RÜKUNU BİTİRİB DURARKƏN DEYİLƏNLƏR

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* qamətini düzəldib rükudan qalxarkən deyərdi: (( سَمِعَ اللهُ لِمَنْ حَمِدَهُ )) **«Səмi‘a-l-lahu liмən həмidəh»** [*Allah ona həmd edəni eşidir*] (əl-Buxari və Müslim).

"Namazı düzgün qılmayana bunu əmr edərək demişdir: "*Təkbir etməyən, rüku etməyən və qamətini düzəldib "Səmia-Allahu limən həmidəh" ifadəsini deməyənin namazı qəbul olunmaz* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Qalxandan sonra durub deyərdi: (( رَبَّنَا وَلَكَ الْحَمْدُ )) **«Rabbənə va ləкə-l-həмd»** [*Rəbbimiz! Həmd Sənə məxsusdur!*] (əl-Buxari və Əbu Davud. Səhih hədisdir). Bunu hər namaz qılana - istər imam olsun, istərsə də qeyrisi olsun,

əmr edərək demişdir: “*Mənim kimi namaz qılın* (əl-Buxari və Əhməd).

O həmçinin deyərdi: “*İmam ona görə seçilir ki, onun etdiklərini namaz qılanlar etsinlər. Əgər o desə ki, “Səmia-Allahu limən həmidəh” siz*: (( اللَّهُمَّ رَبَّنَا وَلَكَ الْحَمْدُ )) **«Allahuммə, Rabbənə va ləкə-l-həмd»** [*Allahım, Rəbbimiz, həmd Sənə məxsusdur*] *deyin. Allah sizi eşidər*. Allah təbarəkə və təala öz Peyğəmbərinin *-səlləllahu aleyhi və alihi və səlləm-* dili ilə: “*Allah Ona həmd edəni eşitdi* demişdir.[55]

Bu məsələni başqa bir hədisdə də izah edib demişdir: “*Bu sözü mələklərin sözü ilə uyğun gələnin bütün keçmiş günahları bağışlanır* (əl-Buxari, Müslim və ət-Tirmizi. Səhih hədisdir).

Rükudan qalxaraq belini düzəldəndən sonra əllərini “ihram təkbirində (namazı başlayanda edilən təkbir – red.) olduğu kimi qaldırır. Dikəldikdən sonra yuxarıda göstərildiyi kimi bu ifadələri deyir:

---

[55] Bu heç də o demək deyildir ki, imamın arxasındakılar “*Səmia Allahu limən həmidəh* ifadəsini demir. Həmçinin, o da demək deyildir ki, imam “*Rabbənə, ləkəl həmd* ifadəsini demir.

1 – (( رَبَّنَا وَلَكَ الْحَمْدُ )) **«Rabbənə va ləкə-l-həмd»** [*Rəbbimiz, həmd Sənə məxsusdur*] (əl-Buxari və Müslim).

2 – (( رَبَّنَا لَكَ الْحَمْدُ )) **«Rabbənə ləкə-l-həмd»** [*Rəbbimiz, həmd Sənə məxsusdur*] (əl-Buxari və Müslim).

Bəzən bu ifadələrə (( اللَّهُمَّ )) "*Allahummə* sözünü əlavə edərdi *(əl-Buxari və Əhməd)*.

Namaz qılanlara da bunu əmr edərək deyərdi: "*Əgər imam desə "səmia Allahu limən həmidəh", siz deyin:* (( اللَّهُمَّ رَبَّنَا لَكَ الْحَمْدُ )) **«Allahuммə, Rabbənə ləкə-l-həмd»** [*Allahım, Rəbbimiz, həmd Sənə məxsusdur*]. *Sözü mələklərin sözü ilə uyğun gələnin bütün keçmiş günahları bağışlanar* (əl-Buxari, Müslim və ət-Tirmizi. Səhih hədisdir).

Bəzən bütün bunlara aşağıdakıları əlavə edərdi:

3 – (( مِلْءَ السَّمَوَاتِ وَمِلْءَ الأَرْضِ ، وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ )) -

**«Mil'ə-s-səмəvaтi va мil'ə-l-ardı, va мil'ə мə şi'тə мin şey'in ba'd»** [*Sənə yer ilə səmalar və istədiyin qədər həmd-sənalar olsun*] (Müslim və Əbu Uvanə).

4 – (( ... مِلْءَ السَّمَوَاتِ وَمِلْءَ الأَرْضِ وَمَا بَيْنَهُمَا ، وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ ))

**«Mil‘ə-s-səməvaтi va мil‘ə-l-ardı va мə beynəhuмə, va мil‘ə мə şi‘тə мin şey‘in ba‘d»** [*Sənə yer ilə səmalar və onların arasındakı qədər, istədiyin qədər həmd-sənalar olsun*] (Müslim və Əbu Uvanə).

Bəzən buna aşağıdakıları da əlavə edərdi:

5 – ( أَهْلَ الثَّنَاءِ وَالْمَجْدِ ، لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ ، وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ )

**«Əhlə-s-sənə‘i va-l-мəcdi, lə мəni‘a liмə ə‘тaутə, va lə мu‘тıyə liмə мənə‘тə va lə yənfə‘u zə-l-cəddi мinкə-l-cədd»** [*Həmd və ülviyyət sahibi! Sənin verdiyinə mane olacaq heç bir şey yoxdur. Sənin mane olduğun şeyi heç kəs verə bilməz. Ey əzəmət Sahibi! Sən fayda verməsən, heç kəs fayda verə bilməz*] (Müslim və Əbu Uvanə).

6 - Bəzən isə bunu deyərdi:

- (( مِلْءَ السَّمَوَاتِ وَمِلْءَ الأَرْضِ ، وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ . أَهْلَ الثَّنَاءِ وَالْمَجْدِ ، أَحَقُّ مَا قَالَ الْعَبْدُ ، وَكُلُّنَا لَكَ عَبْدٌ . اللَّهُمَّ لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ ، وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ ))

**«Mil‘ə-s-səмəvaтi va мil‘ə-l-ardı, va мil‘ə мə şi‘тə мin şey‘in ba‘d. Əhlə-s-sənə‘i va-l-мəcdi, əhaqqu мə qalə-l-abdu, va кullunə ləкə abd. Allahuммə lə мəni‘a liмə ə‘таутə, va lə мu‘тıyə liмə мənə‘тə va lə yənfə‘u zə-l-cəddi мinкə-l-cədd»** [*Sənə yer ilə səmalar qədər və istədiyin başqa şeylər qədər həmd-sənalar olsun. Həmd və Ülviyyət Sahibi! Sənin qulunun dediyi haqdır: Biz hamımız Sənin qulunuq. Allahım! Sənin verdiyinə mane olacaq heç bir şey yoxdur. Sənin mane olduğun şeyi heç kəs verə bilməz. Ey əzəmət Sahibi! Sən fayda verməsən, heç kəs fayda verə bilməz*] (Müslim, Əbu Uvanə və Əbu Davud).

7 - Gecə namazında bəzən bunu deyərdi: (( لربي الحمد ، لربي الحمد)) **«Li rabbi əl-həмdu, li rabbi əl-həмdu»** [*Həmd Rəbbimədir, həmd Rəbbimədir*]. *Bunu təkrarlayardı. Bu vaxt onun bu qiyamı təqribən rüku və birinci qiyam qədər davam edərdi. Bu qiyamda "əl-Bəqərə" surəsini oxuyardı* (Əbu Davud, ən-Nəsai. Səhih hədisdir. "əl-İrva əsəri səh.235).

8 - (( رَبَّنَا وَلَكَ الْحَمْدُ ، حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ )) **«Rabbənə va ləкə-l-həмd, həмdən кəsiran тayyibən мubəraкən fihi»** [*Rəbbimiz həmd Sənə məxsusdur: saysız- hesabsız, gözəl və mübarək həmd*].

“*Peyğəmbərin -səlləllahu aleyhi və alihi və səlləm- arxasında namaz qılmış bir nəfər rükudan başını qaldıranda demişdi: “Səmia-Allahu limən həmidəh”. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- soruşur: “Bir az öncə danışan kim idi?” Kişi deyir: “Mən idim, ya Rəsulullah!” Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- deyir: “Mən otuzdan artıq mələk gördüm ki, bu əcri sənin üçün birinci yazmaqdan ötrü bir-birilə yarışa girmişdilər* (Malik, əl-Buxari və Əbu Davud).

## QİYAMIN UZADILMASI VƏ TAM RAHATLIĞIN VACİBLİYİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* rükudan sonrakı qiyamını təqribən rükusu qədər edərdi, lakin bəzən o qədər durardı ki, hətta az qala unutdun deyilsin.

Rükuda tam rahatlığı əmr edib “namazı düzgün qılmayanana deyərdi: “*(Rükudan) qalxarkən belini (tam) düzəlt, başını dikəlt ta ki, bütün əzalar yerinə qayıtsın*.

Başqa rəvayətdə həmçinin deyilir: Başını qaldırsan, belini düzəlt (əl-Buxari, Müslim, əd-Darimi, əl-Hakim, əş-Şafii və Əhməd).

Həm də demişdir: “*Belə etməyənin namazı tamamlanmamış qalır*.

O, həm də deyərdi: “*Qüdrət və Cəlal sahibi Allah rüku və səcdə arasında belini düzəltməyənin namazına baxmaz* (Əhməd və ət-Təbərani, “əl-Kəbir. Səhih hədisdir).

## SƏCDƏ

Bundan sonra Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təkbir edib səcdəyə gedərdi (əl-Buxari və Müslim).

“Namazı düzgün qılmayana da bunu əmr edərək demişdir: “*Hər bir şəxsin namazı yalnız o, “Səmia-Allahu limən həmidəh” və qəddini düzəldib “Allahu əkbər”*

*deyəndən sonra səcdə edib əzələləri tam rahatlıq tapdıqda tamamlanmış olur* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

"*Səcdə etmək istədikdə təkbir deyərdi* (*Əllərini yanına salardı və sonra səcdə edərdi*). (Əbu Yəla bu hədisi "Müsnəd əsərində (284/2) etibarlı istinadla və İbn Xuzeymə (1/79/2) səhih istinadla rəvayət edirlər).

"*Bəzən səcdədən qabaq əllərini qaldırardı*[56] (ən-Nəsai, əd-Dəraqutni və əl-Muxlis, "əl-Fəvaid əsəri (1/2/2). Səhih hədisdir).

## SƏCDƏ EDƏRKƏN BİRİNCİ ƏLLƏRİ YERƏ QOYMAQ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* səcdədə "*əllərini dizlərindən qabaq yerə qoyardı* (İbn

[56] Səcdədən qabaq əllərin qaldırılması 10 əshabəyə aid edilir və sələflərdən bir çoxu onun şəriətə uyğunluğunu qəbul etmişdir.

Xuzeymə (1/76/1), əd-Dəraqutni, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Bu hədisin səhihliyinə qarşı irəli sürülən fikirlər doğru deyildir. Bu barədə Malik də, Əhməd də danışır. İbn əl-Cauzi "ət-Təhqiq (108/2) və əl-Mərvzi "Məsail (1/147/1) əsərində imam əl-Auzaiyə səhih istinadla bu hədisi rəvayət edirlər. Səcdənin icrasını əmr edərək deyərdi: "*Sizdən biri səcdə edərkən dəvə kimi oturmamalı, əllərini dizlərindən qabaq yerə qoymalıdır* (Əbu Davud və Təmam "əl-Favaid əsəri (108/1), ən-Nəsai "əs-Suğra və "əl-Kubra əsərləri (47/1). Səhih hədisdir).[57]

O həmçinin deyərdi: "*Əllər də üz kimi səcdədə iştirak edir. Sizdən biri üzünü yerə qoyursa, deməli, əllərini də qoymalıdır. Əgər qalxarsa, hər ikisini qaldırmalıdır* (İbn Xuzeymə (1/79/2), Əhməd, əs-Sərrac, əl-Hakim, əz-Zəhəbi. Səhih hədisdir).

O, səcdədə "*ovcunun içini yerə sərib onlara dirənərdi* (Əbu Davud, əl-Hakim, əz-Zəhəbi. Səhih hədisdir).

---

[57] Bunu da bilməlisən ki, dəvə oturanda əvvəlcə dizlərini yerə qoyur, budu da onun əlləridir. Bu barədə "Lisanul-ərəb və başqa kitablarda danışılır.

“*Barmaqlarını birləşdirərdi* (İbn Xuzeymə, əl-Beyhəqi, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir) və “*onları qibləyə doğru yönəldərdi* (əl-Beyhəqi, səhih istinadla. İbn Əbi Şeybə (1/82/2).

“*Əllərini çiyinləri bərabərində qoyardı*, bəzən də “*qulaqları bərabərində olardı*, “*alnını və burnunu yerə qoyardı* (Əbu Davud, ən-Nəsai, ət-Tirmizi və İbn Mülaqqin (27/2). Səhih hədisdir).

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “namazı düzgün qılmayana demişdir: “*Səcdəni tam yerinə yetirməlisən* (Əbu Davud və Əhməd. Səhih hədisdir).

Başqa rəvayətdə deyilir: “*Əgər sən səcdə etsən, üzünü və əllərini yerə düz qoymalısan ki, bədəninin hər bir üzvü öz yerini alsın* (İbn Xuzeymə (1/10/1). Etibarlı hədisdir).

O həmçinin deyərdi: “*Burnunu və alnını yerə vurmayanın namazı qəbul olunmaz* (əd-Dəraqutni, ət-Təbərani (3/140/1) və Əbu Nəim).

“*Dizlərini və ayaq barmaqlarını da yerə düz qoyardı* (əl-Beyhəqi. Səhih hədisdir. İbn Əbi Şeybə (1/82/2). əl-Hakim bunu səhih hesab etmiş və əz-Zəhəbi bununla razıdır).

“*Əl və ayaq barmaqlarını qibləyə doğru yönəldərdi*[58] (əl-Buxari, Əbu Davud, İbn Rahəveyh, "Müsnəd" səsrində (4/129/2), İbn Səd (4/157), “*pəncələri birləşdirərdi* (ət-Təhavi, İbn Xuzeymə (654), əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir), “*bunu əmr etmişdir* (ət-Tirmizi, əs-Sərrac, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* səcdə etdiyi yeddi bədən üzvü bunlardır: “Ovuclar, dizlər, ayaqlar, alın və burun. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* son iki üzvü (alın və burunu) səcdədə bir hesab edib demişdir: “*Əmr olundum ki, (*başqa rəvayətdə: *əmr olunduq ki,) yeddi üzvlə səcdə edilsin. Alın və əli ilə burnuna işarə etdi, iki əl* (başqa sözlə: iki ovuc)*, iki diz, ayaq barmaqları, namazdan əvvəl saç və paltarımızı yığmırıq*[59] (əl-Buxari və Müslim, “İrva əsərində (310)).

O həmçinin deyirdi: “*Əgər bəndə səcdə edirsə, onunla yeddi üzv də səcdə edir: üzü, ovucları, dizləri və ayaqları* (Müslim və Əbu Uvanə).

---

[58] İbn Ömər demişdir ki, hər şey namaz vaxtı qibləyə doğru yönəlməlidir. Hətta baş barmaq da qibləyə yönəlməlidir.

[59] Yəni ruku və səcdə vaxtı və ya namaza qədər saçı və paltarı əl ilə tutub saxlamıram. Namaza qədər saçlar yığılır və paltarın qolu qatlanır.

Saçları daldan hörülmüş bir kişinin namaz qıldığını görəndə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Bu cür namaz qılanın elə bil əl-ayağı bağlanmışdır*.[60] O həmçinin demişdir: "*Bunu şeytan müdafiə edir*, yəni saçların hörüldüyü yerdə şeytan məskən salmışdır (Əbu Davud, ət-Tirmiziyə görə etibarlı, İbn Xuzeyməyə və İbn Hibbana görə, səhihdir. Bax: Əbu Davud, "Səhih səh.653).

"*Səcdə vaxtı biləklərini yerə vurmazdı* (əl-Buxari və Əbu Davud), əksinə, "*onları yeddi yerdən qaldırardı, özündən uzaq tutardı, hətta arxadan qoltuğunun altının ağlığı görünərdi* (əl-Buxari və Müslim. Bax: "əl-İrva səh.359).

"*Hətta əgər onun qoltuğunun arasından quzu keçmək istəsəydi, keçərdi* (Müslim, Əbu Uvanə və İbn Hibban). Əllərini özündən çox araladığı üçün əshabələrindən bəzisi deyərdi: "*Rəsulullah* -səlləllahu aleyhi və alihi və səlləm- *səcdə vaxtı dirsəklərini böyürlərindən o qədər aralı tutardı*

---

[60] Hədisin mənası belədir: "Əgər saçlar dağılmış vəziyyətdə olarsa və səcdə vaxtı yerə dəyərsə bununla öz sahibinin səcdə savabını artırmış olur. Hörülmüş saç səcdə etmir. Hörülmüş - əl-ayağı bağlanmış deməkdir, çünki onlar səcdədə yerə dəymirlər.

Mən deyirəm: Görünür bu hökm qadınlara yox kişilərə aiddir. Bu fikri əş-Şaukani İbn əl-Ərəbiyə istinadən verir.

*ki, ona yazığımız gəlirdi* (Əbu Davud və İbn Macə. Etibarlı hədisdir). Bunu namaz qılanlara əmr edərək demişdir: "*Səcdə edərkən ovuclarını yerə qoy, biləklərini qaldır* (Müslim və Əbu Uvanə). Deyərdi: "*Səcdədə düz vəziyyət alın, heç kəs dirsəklərini (it kimi) yerə qoymamalıdır* (əl-Buxari, Müslim, Əbu Davud və Əhməd).

Başqa bir hədis: "*Biləklərinizi yerə qoyub it oturuşuna bənzər vəziyyət almayın* (Əhməd və ət-Tirmizi. Səhih hədisdir). O həmçinin demişdir: "*Qollarını da yeddi üzv kimi yerə qoyma, əllərin içini yerə dirə və qolları böyründən arala. Belə etsən, bədənin bütün üzvləri səninlə birgə səcdə etmiş olur* (İbn Xuzeymə (1/80/2), əl-Məqdisi, "əl-Muxtar əsəri, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

## SƏCDƏDƏ RAHATLIĞIN VACİBLİYİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* rüku və səcdəni tam icra etməyi tələb edərdi. Belə etməyənləri isə bir-iki xurma ilə doymaq istəyən, lakin buna nail olmayan ac adama bənzədib deyərdi: "*Bu adam ən pis oğurluq etmiş kimidir*.

“Rüku bölməsində qeyd etdiyimiz kimi, rüku və səcdədə belini düzəltməyənin namazını batil edərək namaz qılanın səcdədə də rükuda olduğu kimi tam rahatlıq tələb etmişdir. Bu yuxarıda göstərdiyimiz kimi “namazı düzgün qılmayana əmr edilmişdir.

SƏCDƏ ZİKRLƏRİ

Bu rükndə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* müxtəlif zikrlər və dualar oxuyardı:

1 – (( سُبْحَانَ رَبِّيَ الأَعْلَى )) - **«Subhanə rabbiyə-l-a‘lə»** [*Ən Uca Rəbbim pak və nöqsansızdır*] - üç dəfə (Əhməd, Əbu Davud, İbn Macə, əd-Dəraqutni, ət-Təhavi, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Bəzən bunu üç dəfədən də artıq təkrar edərdi. (İbn Xuzeymə (1/80/2), əl-Məqdisi “əl-Muxtarə, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Bir dəfə gecə namazında bunu o qədər təkrar etdi ki, səcdəsi təqribən qiyama qədər çəkdi. Bu zaman o, üç uzun

surə (“əl-Bəqərə, “ən-Nisa və “Ali-İmran) oxudu. “Gecə namazı fəslində dediyimiz kimi, bütün bunlarla bərabər dua və istiğfar da etdi.

2 – (( سُبْحَانَ رَبِّيَ الأَعْلَى و بَحَمْدِهِ )) - **«Subhanə rabbiyə-l-a‘lə va bihəмdihi»** [*Ən Uca olan pak və nöqsansız Rəbbimə həmd ilə*] - üç dəfə (Səhihdir. Əbu Davud, əd-Dəraqutni, Əhməd, ət-Təbərani və əl-Beyhəqinin rəvayətidir).

3 – (( سُبُّوحٌ ، قُدُّوسٌ ، رَبُّ الْمَلاَئِكَةِ وَالرُّوحِ )) - **«Subbuhun, quddusun, rabbu-l-мələ‘iкəті va-r-ruh»** [*Çox təsbih olunan və ÷ığ İüqəddəs olan, mələklərin və Ruhun (Cəbrayılın) Rəbbi!*] - üç dəfə (Müslim və Əbu Davud).

4 – (( سُبْحَانَكَ اللَّهُمَّ رَبَّنَا وَبِحَمْدِكَ ، اللَّهُمَّ اغْفِرْ لِي )) - **«Subhanəкə-l-lahuммə rabbənə va bihəмdiкə. Allahuммə-ğfirli»** [*Rəbbimiz olan Allahım! Həmd Sənə məxsusdur və Sən pak və nöqsansızsan. Allahım məni bağışla*]. *Bu sözlərlə rüku və*

*səcdəni uzadardı və Qurandan zikr edərdi* (əl-Buxari və Müslim).

5 - (( اللَّهُمَّ لَكَ سَجَدْتُ، وَبِكَ آمَنْتُ، وَلَكَ أَسْلَمْتُ، سَجَدَ وَجْهِيَ لِلَّذِي خَلَقَهُ، وَصَوَّرَهُ، وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ، تَبَارَكَ اللهُ أَحْسَنُ الْخَالِقِينَ )) -

**«Allahuммə ləкə səcədтu və biкə əмənтu, və ləкə əsləмтu, səcədə vachiyə lilləzi xaləqahu, va savvarahu, va şəqqa səм'ahu va basarahu, тəbəraкə-l-llahu əhsənu-l-xaliqin»** [*Allahım! Sənə səcdə etdim, Sənə iman gətirdim, Sənə təslim oldum. Sən mənim Rəbbimsən. Sifətim onu xəlq Edənə, ona quruluş Verənə və əlvə olaraq, eşitmək və görmək bəxş edən Allaha səcdə etdi. Yaradanların ən gözəli Allah mübarəkdir*] (Müslim, Əbu Uvanə, ət-Təhavi və əd-Dəraqutni).

6 – (( اللَّهُمَّ اغْفِرْ لِي ذَنْبِي كُلَّهُ ، دِقَّهُ وَجِلَّهُ ، وَأَوَّلَهُ وَآخِرَهُ ، وَعَلا نِيَتَهُ وَسِرَّهُ )) -

**«Allahuммə-ğfirli zənbi кulləhu, diqqahu va cilləhu, va avvaləhu va axirahu va alə niyəтəhu va sirrahu»** [*Allahım! Günahlarımın hamısını – kiçiyini və*

*böyüyünü, ilkini və sonuncusunu, gizlinini və aşkarını bağışla*] (Müslim və Əbu Uvanə).

7 – ((سجد لك سوادي و خيالي، وامن بك فوادي، ابء بنعمتك علي، هذي يدي و ما جنيت علي نفسي))

**«Səcədə ləкə səvadi va xəyali, va əмənə biкə fuadi. Əbu-u bini'мəтiкə aleyyə həzzihi yədəyyə, və мə cənnəbтu alə nəfsi»** [*Sənə gerçəklikdə də, xəyalda da səcdədəyəm. Qəlbimdə Sənə iman gətirdi. Mənə bəxş etdiyin nemətlərlə bəhrələndim*] (İbn Nasr, əl-Bəzzar, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

8 – (( سُبْحَانَ ذِي الْجَبَرُوتِ، وَالْمَلَكُوتِ، وَالْكِبْرِيَاءِ، وَالْعَظَمَةِ )) -

**«Subhanə zi-l-cəbəruтi, va-l-мələкuтi, va-l-кibriyə‘i, va-l-azaмəтi»** [*Qüdrət, hökmranlıq, böyüklük və əzəmət Sahibi olan Allahım pak və nöqsansızdır!*] (Əbu Davud və ən-Nəsai. Səhih hədisdir).

Bu və sonrakı zikrləri gecə namazında oxuyardı:

9 – (( سُبْحَانَكَ اللَّهُمَّ رَبَّنَا وَبِحَمْدِكَ ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ )) - **«Subhanəкə-l-lahuммə rabbənə va bihəмdiкə. Lə iləhə illə ənтə»** [*Rəbbimiz olan Allahım! Həmd Sənə məxsusdur və Sən pak və nöqsansızsan. Səndən başqa ibadətə layiq ilah yoxdur*] (Müslim, Əbu Uvanə, ən-Nəsai və İbn Nasr).

10 – (( اللهم اغفر لي ما اسررت و ما اعلنت )) **«Allahuммə-ğfirli мə əsrarтu və мə ə'alənтu»** [*Allahım! Gizli və aşkar günahlarımı bağışla*] (İbn Əbi Şeybə (62/112/1), ən-Nəsai, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

11 – (( اللَّهُمَّ اجْعَلْ فِي قَلْبِي نُورًا، وَ فِي لِسَانِي نُورًا، و فِي سَمْعِي نُورًا، وَ فِي بَصَرِي نُورًا، وَ مِنْ فَوْقِي نُورًا، وَمِنْ تَحْتِي نُورًا ا، وعن يميني نورا، وعن شمالي نورا، وَمِنْ أَمَامِي نُورًا، و مِنْ خَلْفِي نُورًا ، واجعلي في نفسي نورا، واعظم لي نورا )) -

**«Allahuммə-c'al fi qalbi nuran, va fi lisəni nuran, va fi səм'i nuran, va fi basarı nuran, va мin fauqi nuran, va мin тəhтi nuran, va an yəмini nuran va an şiмəli nuran, va мin əмəмi nuran, va мin xəlfi**

**nuran, va-c‘al fi nəfsi nuran, va a‘zıм li nuran»** [*Allahım! Qəlbimi və dilimi, qulaqlarımı və gözlərimi nurlandır, altımı və üstümü, sağımı və solumu, önümü və arxamı nura bürü. Nəfsimi də nurlu et və mənə böyük nur ver*] (Müslim, Əbu Uvanə, İbn Əbi Şeybə “əl-Müsnəf (12/106/2) və 112/1).

12 – (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ ، وَبِمُعَافَاتِكَ مِنْ عُقُوبَتِكَ ، وَأَعُوذُ بِكَ مِنْكَ ، لاَ أُحْصِي ثَنَاءً عَلَيْكَ أَنْتَ كَمَا أَثْنَيْتَ عَلَى نَفْسِكَ ))

**«Allahuммə inni ə‘uzu birıdaкə мin səxaтıкə va biмu‘afəтikə мin uqubəтikə və ə‘uzu biкə мinкə, lə uhsı sənə‘ən aleyкə ənтə кəмə əsneyтə alə nəfsiкə»** [*Allahım! Məndən razı qalmaq üçün Sənin qəzəbindən, bağışlanmaq üçün Sənin cəzandan və Səndən Sənə sığınıram. Sənə olan həmd-sənaların sonu yoxdur, Sənin Özün Özünə etdiyin həmd-sənaları mən sadalamağa qadir deyiləm*] (11-ci zikrin mənbələri ilə eynidir).

## SƏCDƏ VAXTI QURAN OXUMAĞIN YASAQ EDİLMƏSİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və slləm-* rükuda olduğu kimi, səcdədə də Quran oxunmasını yasaq edərək bu rükndə dua və zikri artırmağı əmr etmişdir. Bu barədə "Rüku fəslində danışmışıq.

O deyərdi: "*Bəndə öz Rəbbinə ən çox səcdə vaxtı yaxınlaşır. Səcdədə duanı çox edin* (Müslim, Əbu Uvanə və əl-Beyhəqi, "əl-İrva, səh.456).

## SƏCDƏNİN UZADILMASI

Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* səcdəsi öz müddəti etibarı ilə rükuya yaxın idi. Bir əshabənin aşağıdakı rəvayətindən göründüyü kimi müəyyən səbəblər üzündən hətta səcdəni daha çox uzadarmış:

"*Namazlarının birində (Zöhr və ya Əsr) Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- qucağında Həsən və*

*yaxud Hüseyn namaza gəldi. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- irəli çıxıb uşağı sağ tərəfdə yerə qoydu. Təkbir edib namaza durdu. Namaz vaxtı səcdə etdi, lakin səcdəsi çox uzandı. Başımı qaldırıb gördüm ki, Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- səcdədədir, uşaq isə onun belində oturmuşdur. Yenə səcdəyə qayıtdım. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- namazı tamamladıqdan sonra soruşdular: "Ya Rəsulullah! Sən namaz vaxtı səcdəni o qədər uzatdın ki, biz elə bildik, bir iş baş verib, ya da sənə vəhy gəlir".*

*O dedi: "Heç nə olmayıb. Amma oğlum məni minmişdi. Uşağı özüm düşürtmədim ki, qoy işində olsun"* (ən-Nəsai, İbn Asəakir (4/257/1-2), əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Başqa hədisdə deyilir: "*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- namaz vaxtı səcdə edəndə Həsən və Hüseyn hoppanıb onun belinə minirlər. Onları düşürmək istəyəndə işarə ilə bildirdi ki, mane olmayaq.*[61] *Namazı bitirdikdən sonra onları öz qucağında otuzdurub dedi: "Məni*

---

[61] İbn Xuzeymə bu barədə yazır: "Bu onu göstərir ki, namaz vaxtı bir işi işarə ilə bildirmək namazı pozmur".

Mən deyirəm: "Rəy əhli bu fiqhi yasaq etmişlər".

*istəyən adam bunları da istəməlidir* (İbn Xuzeymə, "Səhih (887), İbn Məsud və əl-Beyhəqiyə istinadən verilən etibarlı hədisdir).

## SƏCDƏNİN ÜSTÜNLÜYÜ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sələm-* demişdir: "*Mənim ümmətimdən elə bir adam yoxdur ki, qiyamət günü onu görəndə tanımayım". Ondan soruşurlar: "Ya Rəsulullah! Bu qədər adamın içində Sən onları necə tanıya bilərsən? O belə cavab verir: "Tutaq ki, ilxının salındığı tövləyə girmisiniz. Orada çoxsaylı qara atlar vardır. Lakin bir at da vardır ki, alnında, əllərində və ayaqlarında ağ xallar vardır. Onu tezcə seçərsinizmi?" Dedilər ki, bəli. Onda dedi: "Mənim ümmətim həmin gün səcdədən üzü ağdır, dəstəmaz almaqdan əlləri və ayaqları dümağdır* (Əhməd, ət-Tirmizi. Səhih hədisdir. "Səhih əsərində).

O deyir: "*Əgər Allah cəhənnəm əhlindən birinə rəhm eləsə, mələklərə əmr edər ki, onu oddan xaric etsinlər. Əgər bəndə ibadət etmişsə, onun alnında səcdənin izləri qalmış*

*olur. Allah odu səcdə izini yandırmaqdan məhrum etmişdir. Adəm övladının hər yerinə od toxunar, alnındakı səcdə yerindən başqa*[62] *bütün Adəm övladı odda yanar* (əl-Buxari və Müslim).

## YERDƏ VƏ HƏSİR ÜSTÜNDƏ SƏCDƏ ETMƏK

O, çox vaxt quru yerdə səcdə edərdi. Çünki məscidində həsir və ya başqa nə isə döşənməmişdir. Aşağıdakı hədis buna dəlalət edir:

"*Əshabələr onunla birgə ən şiddətli istidə belə namaz qılardılar. Onlardan biri alnını yerə vura bilmədikdə paltarını sərib onun üzərində səcdə edərdi* (Müslim və Əbu Uvanə).[63]

O deyərdi: "*Mənə və ümmətimə yer üzü məscid və təmizləyici edildi. Mənim ümmətimdən olan adam istədiyi yerdə namaz qıla bilər, bura ona məscid olar, bu yer təmizləyici (təyəmmüm və s. üçün – red.) olar. Məndən qabaq*

---

[62] Asi olub, lakin namaz qılmış müsəlman əbədi odda yanmağa məhkum edilmir.

[63] Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* məscidində həsir və başqa xalça, palaz sərilməmişdi. Bunu çoxsaylı hədislər də sübut edir.

*bunu qəbul etməmiş, öz kilsələrində və məbədlərində ibadət etmişlər* (Əhməd, əs-Sərrac və əl-Beyhəqi. Səhih hədisdir).

Bəzən hətta palçıqda və suda da səcdə edərdi. Bir dəfə Ramazan ayının 21-də səhər bərk yağış yağır. Məscidin damı xurma yarpaqlarından olduğu üçün damır. Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- palçıq və su içində səcdə edir. Əbu Səid əl-Xudri deyir: "*Mən Rəsulullahın üzündə, gözlərinin üstündə, alnında və burnunda su və palçığın izlərini gördüm* (əl-Buxari və Müslim).

O, "*bir parça həsir üzərində səcdə edərdi* (əl-Buxari və Müslim).

Bəzən də "*həsir üzərində səcdə edərdi* (Müslim və Əbu Uvanə).

Bəzən isə "*əynindəki paltarı sərib üzərində namaz qılardı* (əl-Buxari və Müslim).[64]

SƏCDƏDƏN QALXMAQ

---

[64] Hədisdən göründüyü kimi, əyin paltarı üzərində oturmaq olar. Həm də ipək üzərində oturmağı haram edir.

*P eyğəmbər -səlləllahu aleyhi və alihi və sələm- təkbir edərək başını səcdədən qaldırardı* (əl-Buxari və Müslim). Bunu “namazı düzgün qılmayana əmr edərək demişdir: “*Namaz o zaman tamamlanır ki, namaz qılan səcdə etsin. Bütün bədən üzvləri rahatlıq tapsın, sonra “Allahu əkbər” deyib və başını qaldırıb otursun* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir). Bəzən “*bu təkbirlə bərabər əllərini də qaldırardı* (Əhməd və Əbu Davud. Səhih hədisdir).

Bundan sonra “*sol dizini qatlayıb onun üstündə oturardı və rahatlanardı* (əl-Buxari, Əbu Davud, Müslim, Əbu Uvanə, “əl-İrva, səh.316. Səhih hədisdir). Bunu “namazı düzgün qılmayana da əmr edərək demişdir: “*Səcdə etsən, onu tam icra et, qalxıb otursan, sol budun üstə otur* (Əbu Davud və Əhməd. Yaxşı istinadlı hədisdir).

“*Sağ ayağını  dik qoyardı”* (əl-Buxari və Beyhəqi).

“*Barmaqlarını qibləyə yönəldərdi* (ən-Nəsai. Səhih hədisdir).

İKİ SƏCDƏ ARASI OTURMA

“*Bəzən diz üstə oturardı; ayağının pəncələrini və dizə qədər hissəsini yerə düz qoyardı* (Müslim, Əbu Uvanə və Əbu Şeyxin “Əbu Zubeyrin Cabirdən rəvayət etdikləri əsərində 104/106 saylı hədis, əl-Beyhəqi).

## İKİ SƏCDƏ ARASINDA RAHATLIĞIN VACİBLİYİ

“*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- iki səcdə arasında bədəninin hər bir üzvü öz yerini alana qədər istirahət edərdi* (Əbu Davud və əl-Beyhəqi. Səhih hədisdir). “Namazı düzgün qılmayana bunu əmr edərək demişdir: “*Bunu etməyənin namazı tamamlanmaz* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Rahatlanmanı təqribən “*səcdə qədər uzadardı”* (əl-Buxari və Müslim). Bəzən “*onu o qədər uzadardı ki, elə bilirdilər ki, (namazı) unudubdur”*[65] (əl-Buxari və Müslim).

---

[65] İbn əl-Qayyim demişdir: “Əshabələr dövr ötüb keçəndən sonra adamlar bu sünnəni unutdular. Sünnənin hökmü belədir ki, o özünə zidd olan fikirləri rədd edir, bu hidayət yoluna müxalif olanları qəbul etmir.

## SƏCDƏLƏRARASI ZİKRLƏR

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sәlləm-* səcdələrarası istirahət oturuşunda bu zikrləri deyərdi:

1 – (( اللَّهُمَّ اغْفِرْ لِي، وَارْحَمْنِي، وَاهْدِنِي، وَاجْبُرْنِي، وَعَافِنِي، وَارْزُقْنِي، وَارْفَعْنِي )) -

**«Allahuммə-ğfirli, varhaмni, vahdini, vacburni, va afini, varzuqni, varfa‘ni»** [*Allahım!* (Başqa variantda: *Rəbbim) Məni bağışla, mənə rəhm et, məni doğru yola yönəlt, əyər-əksiyimi düzəlt, mənə sağlamlıq, ruzi ver və məni yüksəlt*] (Əbu Davud, ət-Tirmizi, İbn Macə, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir). Bəzən də deyərdi:

2 - (( رَبِّ اغْفِرْ لِي ، رَبِّ اغْفِرْ لِي )) - **«Rabbi-ğfirli, rabbi-ğfirli»** [*Rəbbim! Məni bağışla! Rəbbim! Məni bağışla*] (İbn Macə. Etibarlı hədisdir).

Bunları gecə namazında deyərdi.

“*Sonra təkbir edib ikinci səcdəni icra edərdi* (əl-Buxari və Müslim).

Səcdələrarası vaxtda “namazı düzgün qılmayana tam rahatlıq tapmağı məsləhət bilib demişdi:

“*Sonra deyirsən “Allahu əkbər” Səcdə edərsən ki, bədən üzvləri rahatlansın. Bütün namazda belə hərəkət etməlisən”* (Əbu Davud, əl-Hakim, əz-Zəhəbi. Səhih hədisdir).

“*Bəzən Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bu təkbirlə əllərini də yuxarı qaldırardı* (Əbu Uvanə və Əbu Davud. Səhih hədisdir).

“*Bu səcdədə də birincidə etdiklərini edərdi. Sonra təkbir edərək başını səcdədən qaldırardı* (Müslim və əl-Buxari). “Namazı düzgün qılmayana da eynilə bunları əmr etdi. Ona ikinci səcdəni yuxarıda qeyd etdiyimiz kimi əmr etdikdən sonra belə demişdir: “*Sonra təkbir edərək başın səcdədən qaldırarsan* (Əbu Davud, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir). Sonra yenə demişdir: “*Hər bir rükətdə və səcdədə belə etməlisən. Əgər bunu etsən, deməli, namazın tamamlanar. Əgər bir naqisliyə yol versən, onda namazın da naqis olar* (ət-Tirmizi, Əhməd. Səhih hədisdir).

Bəzən səcdədən başını qaldırarkən “*əllərini də qaldırardı”* (Əbu Uvanə, Əbu Davud. Səhih hədisdir).

## İSTİRAHƏT ÜÇÜN OTURMA

Bundan sonra “*sol ayağını dizdən bükərək onun üstündə oturardı ki, bədənin hər bir əzələsi öz yerini alsın*[66] (əl-Buxari və Əbu Davud).

## ƏLLƏRİ DAYAQ EDİB RÜKƏTƏ QALXMA

Sonra “*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- əllərini yerə dayayıb ikinci rükətə qalxardı* (əş-Şafii və əl-Buxari).

“*Namazda həmişə əllərini dayaq verib qalxardı* (Əbu İshaq əl-Hərbi və əl-Beyhəqi. Səhih hədisdir).

---

[66] Fəqihlər bunu istirahət oturuşu kimi tanıyırlar. İmam əş-Şafiinin Əhmədə istinadən verdiyi rəvayətlərdə bu barədə danışılır. Bax: “ət-Təhqiq əsəri (111/1). Sünnə tərəfdarları arasında bu oturuşa müxalif olan yoxdur.

“*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- ikinci rükətdə qalxıb sükut*[67] *etmədən “əl-həmdu lilləh” deyib onu başlayardı və duanı axıra çatdırardı* (Müslim və Əbu Uvanə). Bu rükətdə də birincidə etdiklərini edərdi. Lakin bu rükəti, yuxarıda qeyd olunduğu kimi, daha çox qısaldardı.

## HƏR BİR RÜKƏTDƏ FATİHƏNİN QİRAƏTİNİN VACİBLİYİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “namazı düzgün qılmayana birincidə olduğu kimi “*bütün rükətlərdə əl-Fatihə”ni oxumağı əmr etmişdir* (Əbu Davud və Əhməd. Səhih hədisdir). O demişdir: “*Bunu bütün namazda yerinə yetir* (əl-Buxari və Müslim). Başqa rəvayətdə deyilir: “*Hər rükətdə* (Əhməd. Etibarlı hədisdir).

---

[67] Hədisdə yasaq olunan sükut “istiftah duasını oxumaq üçün edilən sükutun olması ehtimal olunur. “İstiazə (“Əuzu billəhi minəş-şeytanir-racim) üçün edilən sükuta aid deyil. Buna aid olması ehtimalı da var. Mənə görə birinci rəy daha qüvvətlidir. Fəqihlər birinci rükətdən başqa digər rükətlərdə “istiazənin edilməsində ixtilaf etmişlər. Bizə görə hər rükətdə deyilməsi şəriətə uyğundur.

Həmçinin demişdir: “*Hər rükətdə qiraət vardır*[68] (İbn Macə, İbn Hibban “Səhih əsəri, Əhməd “Məsail ibn Hani (1/62) və Malik “əl-Muvatta əsəri).

## BİRİNCİ TƏŞƏHHÜD

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* ikinci rükəti bitirdikdən sonra təşəhhüd üçün oturardı. Əgər namaz Sübh namazında olduğu kimi iki rükət olurdusa, iki səcdə arasında olduğu kimi sol ayağının üzərində, sağ ayağını dik qoyaraq (“iftiram) oturardı (ən-Nəsai (1/173). Səhihdir). Həmçinin üç və dörd rükətli namazların birinci təşəhhüdündə də belə oturardı (əl-Buxari və Əbu Davud).

Bunu “namazı düzgün qılmayana da əmr edərək demişdir: “*Əgər namazın tən yarısında otursan, rahatlan, sol dizini büküb onun üstündə otur və təşəhhüd et* (Əbu Davud və əl-Beyhəqi. Etibarlı istinadla).

---

[68] Cabir demişdir: "Bir rükət qılıb Quranın gözünü (hərfən “anasını - yəni “əl-Fatihəni) oxumayan namaz qılmayan kimidir. Yalnız imamın arxasında qılınan namaz istisnadır. Bunu Malik “əl-Muvatta əsərində rəvayət etmişdir.

Əbu Hureyrə *–radıyallahu anhu-* demişdir: "*Mənim dostum -səlləllahu aleyhi və alihi və səlləm- it oturuşu ilə oturmağı mənə yasaq etmişdir* (ət-Təyalisi, Əhməd və Əbu Şeybə).

"*Həmçinin şeytan oturuşunu* (yəni ayaq barmaqlarını bükməyib düz saxlayaraq dabanları üzərinə çökməyi) *qadağan etmişdir* (Müslim, Əbu Uvanə və başqaları).

"*Təşəhhüdə oturanda sağ ovcunu sağ budu* (başqa bir rəvayətdə: dizi) *üstə qoyardı. Sol ovcunu sol budu* (başqa bir rəvayətdə: *dizi*) *üstə qoyardı* (Müslim və Əbu Uvanə).

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- sağ dirsəyini sağ budunun üstünə qoyardı* (yəni qolunu aralamazdı. Bax: İbn əl-Qayyim "əz-Zad əsəri).

Bir kişi namazda oturub sol əlinə söykənmişdi. Bunu görəndə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* dedi: "*Bu yəhudilərin namazıdır* (əl-Beyhəqi və əl-Hakim. Səhih hədis hesab edilir. əz-Zəhəbi də bununla razı olmuşdur. Bax: "əl-İrva", 380).

Başqa bir hədisdə deyilir: "*Bu cür oturmayın. Bu, əziyyətə məruz qalanların oturuşudur* (Əhməd və Əbu Davud. Etibarlı hədisdir).

Başqa bir hədisdə: “*Bu qəzəbə gələnlərin oturuşudur* deyilir (Abdur-Rəzzaq və Abdul-Haqq “Əhkam-1284).

## TƏŞƏHHÜDDƏ BARMAĞIN TƏRPƏDİLMƏSİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* sol ovcunu sol dizinin üstünə açıq şəkildə qoyardı. Sağ əlinin barmaqlarının hamısını bükərdi. Şəhadət barmağı ilə qibləyə işarə edər və ona baxardı[69] (Müslim, Əbu Uvanə, İbn Xuzeymə, Əl-Hümeydi “Müsnəd (131/1) və Əbu Yəla (275/2). Səhih hədisdir).

“*Barmağı ilə işarə edəndə baş barmağını orta barmağının üstünə qoyardı* (Müslim və Əbu Uvanə).

Bəzən onu “*dairəvi şəkildə qoyardı* (və ya havada onunla dairə cızardı) (Əbu Davud, ən-Nəsai, İbn əl-Carud əl-Müntəqqi (208), İbn Xuzeymə (1/86/1-2), İbn Hibban “Səhih (485). Səhih hədisdir).

---

[69] İbn Ömərin səhih rəvayətində deyilir: “Bu şeytanı hədələməkdir. Bu doğrudur. Hamı belə deyir.

Barmağını qaldırardı, tərpədərdi və dua edərdi[70] (yuxarıda göstərilən mənbələr) və deyərdi: "*Bu barmağın* (şəhadət barmağının) *işarəsi şeytan üçün dəmirdən də ağırdır* (Əhməd, əl-Bəzzar, Əbu Cəfər, əl-Büxtəri, "əl-Əmali (60/1), ət-Təbərani "əd-Dua (273/1), Abdul Ğəni əl-Məqdisi, "əs-Sünən (12/2). Yaxşı hədisdir. "Müsnəd əsəri (249/2) və əl-Beyhəqi).

"*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bunu hər iki təşəhhüd zamanı edərdi* (ən-Nəsai və əl-Beyhəqi. Səhih hədisdir).

Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* əshabələri bir-birinə, yəni dua vaxtı barmağla işarə

---

[70] Mən deyirəm: "Bu həmçinin onu göstərir ki, barmağın işarəsi və tərpədilməsi salama qədər davam etməlidir. Ondan qabaq dua oxumaq Malikin və başqalarını məzhəbinə uyğundur. İmam Əhməddən soruşurlar: "Adam namaz qılanda barmağı ilə işarə edirmi? O deyir: "Bəli, çox lazımdır. Bunu İbn Hani "İmam Əhmədin məsələləri (səh.80) əsərində də qeyd edir.

Mən deyirəm: "Bundan aydın olur ki, təşəhhüd vaxtı barmağın tərpədilməsi Peyğəmbərdən *-səlləllahu aleyhi və alihi və səlləm-* qalan sabit qaydadır. Bunu Əhməd və başqa Sünnə imamları da qeyd etmişlər. Bunu əbəs adlandırıb namazı layiq olmadığını iddia edənlər Allahdan qorxmalıdırlar. Onun tərpədilməsinin sübuta yetirilən əməl olmasını bilmələrinə baxmayarq onu etmirlər. Bu qaydanı nə ərəb dili qaydalarına, nə də görkəmli imamların göstərişlərinə uyğun olmayan bir şəkildə təhrif edirlər.

edilməsinə diqət yetirirdilər (İbn Əbi Şeybə (2/123/2). Yaxşı hədisdir).

“Dua vaxtı iki barmağı ilə işarə edərək dua edən birisini gördükdə Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Biri ilə, biri ilə və sonra şəhadət barmağını göstərdi* (İbn Əbi Şeybə (12/40/1) və (2/123/2), ən-Nəsai, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

## BİRİNCİ TƏŞƏHHÜDÜN VACİBLİYİ VƏ ONDA DUANIN ŞƏRİƏTƏ UYĞUNLUĞU

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “*hər iki rükətdən bir “əttəhiyyatu lilləhi” (təşəhhüd) oxuyardı* (Müslim və Əbu Uvanə).

“*Oturanda gördüyü ilk iş Allahı salamlamaq olurdu* (əl-Beyhəqinin Aişədən yaxşı istinadla verdiyi rəvayət, İbn əl-Müləqqin də bunu demişdir (28/2)).

“*Əgər birinci iki rükətdə onu unutsaydı səhv səcdəsini edərdi* (əl-Buxari və Müslim. “İrvaul-ğəlil, 338).

Bunu əmr edərək demişdir: “*Əgər otursanız, hər bir rükətdə deyin: “əttəhiyyatu lilləhi...” Sizdən biri xoşuna gələn duanı səçərək “əttəhiyyatla” bərabər onu da Qüdrət və Cəlalət sahibi Allaha dua etsin*[71] (ən-Nəsai, Əhməd və ət-Təbərani, “əl-Kəbir əsəri (3/25/1). Səhih hədisdir).

Başqa bir rəvayətdə deyilir: *“Hər iki rükətdən bir oturub “əttəhiyyatu”... və i. a. deyin* (ən-Nəsai. Səhih hədisdir).

Yuxarıda qeyd edildiyi kimi, “namazı düzgün qılmayana da bunu əmr etmişdir.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* onlara (əshabələrə - red.) Qurandan surə öyrədən kimi təşəhhüdü öyrədərdi (əl-Buxari və Müslim).

## TƏŞƏHHÜDÜN FORMALARI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təşəhhüdün müxtəlif formalarını öyrətmişdir:

---

[71] Hədisdən göründüyü kimi hər təşəhhüddə dua şəriətə müva-fiqdir.

1 - İbn Məsudun təşəhhüdü. O demişdir: “Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- Qurandan surə öyrədirmiş kimi əlimi ovucları arasına alaraq mənə təşəhhüd öyrətdi:

- (( التَّحِيَّاتُ للهِ ، وَالصَّلَوَاتُ ، وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ . أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ))

**«Ət-təhiyyətu lilləhi, va-s-salavatu**[72]**, va-t-tayyibətu**[73]**, əs-sələmu**[74] **aleykə əyyuhə-n-nəbiyyu va rahmətu-l-lahi va bərəkətuhu, əs-sələmu aleynə va alə ibədi-l-ləhi-s-salihin. Əşhədu ən lə iləhə illə-l-lah va əşhədu ənnə Muhamməden abduhu va rasuluhu»** [*Allaha həmd-sənalar, xeyir-dualar olsun. Bütün yaxşı işlər də Allah üçündür. Peyğəmbərə salam olsun! Allahın mərhəməti və bərəkəti ona yetişsin. Bizə və Allahın*

---

[72] Salam, mülk və bəqa bildirən sözlər yalnız Allaha ünvanlana bilər. Salavat, yəni Allah təalaya təzimi ifadə edən dualar Ondan başqasına layiq ola bilməz.

[73] Təyyibat - Ən xoş və gözəl sözlər. Bunlar Allaha tərif və səna üçündür. Bu sözlər yalnız Allahın sifətlərinə layiqdir.

[74] Mənası Allaha pənah aparmaq və Ona sığınmaq deməkdir. Salam Allah təalanın adıdır. Onun mənası Allah səni qoruyan və himayə edəndir deməkdir. Necə ki, deyirlər: “Allah köməyin olsun. Yəni Allah hifz, kömək və lütfkarlıqla səninlə olsun.

*əməli-saleh qullarına salam olsun. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur və şəhadət edirəm ki, Məhəmməd Onun qulu və elçisidir*]. *Əgər belə deyilərsə, həm Yerdə, həm də göydə hər bir əməli-saleh qul savaba nail olar:* **«ßøə ı -- øə ıı İiiəı ə ð»**

*Bunu peyğəmbər bizim aramızdaykən (sağ olarkən) deyərdik. Vəfatından sonra* “***əssələmu alən-nəbiyyi***[75] [*Peyğəmbərə salam olsun*] *deyərdik* (əl-Buxari, Müslim, İbn Əbi Şeybə (1/90/2), əs-Sərrac və Əbu Yəla, “Müsnəd (258/2), “əl-İrva (123)).

2 - İbn Abbasın təşəhhüdü. O demişdir: “*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- bizə təşəhhüdü Quran surəsini öyrətdiyi kimi öyrədib deyərdi:*

- (( التَّحِيَّاتُ المُبَرَكَاتُ الصَّلَوَاتُ الطَّـيِّـبَاتُ للهِ ، **[ال]** سَّلاَمُ عَلَيْكَ أَيـُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، **[ال]** سَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ

---

[75] İbn Məsudun “Peyğəmbərə salam olsun ifadəsinin mənası odur ki, Allah rizasını qazanmış əshabələr təşəhhüddə deyərdilər: “Sənə salam olsun, ey Peyğəmbər! Bu zaman Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* sağ idi. O, vəfat etdikdən sonra bunu dəyişib: “Peyğəmbərə salam olsun! dedilər. Bu ifadəyə Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* razılığının olduğuna şübhə yoxdur.

. أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَ **[أَشْهَدُ ]** أَنَّ مُحَمَّدًا رَسُولُ للهِ )) ((**عَبْدُهُ وَرَسُولُهُ** ((

**«Əт-тəhiyyəтu əl-мubaraкaтu əs-salavaтu əт-тayyibəтu lilləhi, [əl]-səlәмu aleyкə əyyuhə-n-nəbiyyu va rahмəтu-l-lahi va bərəкəтuhu, [əl]-səlәмu aleynə va alə ibədi-l-ləhi-s-salihin. Əşhədu ən lə iləhə illə-l-lah va [əşhədu] ənnə Muhaммədən rasulilləhi** (başqa rəvayətdə: **abduhu va rasuluhu**)**»** (Müslim, Əbu Uvanə, əş-Şafii və ən-Nəsai).

3 - İbn Ömərin təşəhhüdü. Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təşəhhüddə deyərdi:

- (( التَّحِيَّاتُ للهِ ، **[و]** الصَّلَوَاتُ ، **[و]** الطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ [**وَبَرَكَاتُهُ**] ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ . أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ [**وَحْدَهُ لاَ شَرِيكَ لَهُ**] وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ))

**«Əт-тəhiyyəтu lilləhi [vəs]-salavaтu [vəт]-тayyibəтu, ə-səlәмu aleyкə əyyuhə-n-nəbiyyu va rahмəтu-l-lahi (**İbn Ömər deyir ki, mən bunu artırdım: **va bərəкəтuhu**)**, əs-səlәмu aleynə va alə ibədi-l-ləhi-s-**

**salihin. Əşhədu ən lə iləhə illə-l-lah** (İbn Ömər deyir ki, mən bunu artırdım: **vəhdəhu lə şərikə ləhu**)[76] **va əşhədu ənnə Muhaммədən abduhu va rasuluhu»** [*Allaha həmd-sənalar, xeyir-dualar olsun. Bütün yaxşı işlər də Allah üçündür. Peyğəmbərə salam olsun! Allahın mərhəməti və bərəkəti ona yetişsin. Bizə və Allahın əməli-saleh qullarına salam olsun. Mən şəhadət edirəm ki, Vahid və şəriksiz Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur və şəhadət edirəm ki, Məhəmməd Onun qulu və elçisidir*] (Əbu Davud və əd-Dəraqutni. Səhihdir).

4 - Əbu Musa əl-Əşarinin təşəhhüdü. Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- demişdir:

- (( التَّحِيَّاتُ الطَّيِّبَاتُ الصَّلَوَاتُ للهِ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ . أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ [**وَحْدَهُ لاَ شَرِيكَ لَهُ**] وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ))

---

[76] Bu iki əlavə Peyğəmbərdən -*səlləllahu aleyhi və alihi və səlləm*- rəvayət edilən təşəhhüddə sabitdir. İbn Ömər bunu şəxsən özü peyğəmbərdən eşidərək artırmışdır. Bu əlavə başqa əshabələrdən alınmış, Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm*- istinadən verilir.

**«Əт-тəhiyyəтu əт-тayyibəтu əs-salavaтu lilləhi, əs-sələмu aleyкə əyyuhə-n-nəbiyyu va rahмəтu-l-lahi va bərəкəтuhu, əs-sələмu aleynə va alə ibədi-l-ləhi-s-salihin. Əşhədu ən lə iləhə illə-l-lah vəhdəhu lə şərıкə ləhu va əşhədu ənnə Muhaммədən abduhu va rasuluhu»** [*Bütün yaxşılıqlar Allah üçündür. Allaha həmd-sənalar, xeyir-dualar olsun. Peyğəmbərə salam olsun! Allahın mərhəməti və bərəkəti ona yetişsin. Bizə və Allahın əməli-saleh qullarına salam olsun. Mən şəhadət edirəm ki, Vahid və şəriksiz Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur və şəhadət edirəm ki, Məhəmməd Onun qulu və elçisidir*] *Bu yeddi söz namazın təşəhhüdüdür* (Müslim, Əbu Uvanə, Əbu Davud və İbn Macə).

5 - Ömər bin əl-Xəttabın təşəhhüdü. Allah rizasını qazanmış namaz qılanlara aşağıdakı təşəhhüdü öyrədərdi:

- (( التَّحِيَّاتُ للهِ ألـزَّاكيَاتُ للهِ الطَّـيِّـبَاتُ [للهِ] ، السَّلاَمُ عَلَيْكَ أيـُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ . أَشْهَدُ أَنْ لاَ إِلَـهَ إِلاَّ اللهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ))

**«Əт-тəhiyyəтu lilləhi, əz-zəкiyyəтu lilləhi, əт-тayyibəтu lilləhi, əs-sələмu aleyкə əyyuhə-n-nəbiyyu va rahмəтu-l-lahi va bərəкəтuhu, əs-sələмu aleynə va alə ibədi-l-ləhi-s-salihin. Əşhədu ən lə iləhə illə-l-lahu va əşhədu ənnə Muhaммədən abduhu va rasuluhu»** [*Bütün yaxşılıqlar, gözəlliklər, həmd-sənalar, xeyir-dualar Allah üçündür. Peyğəmbərə salam olsun! Allahın mərhəməti və bərəkəti ona yetişsin. Bizə və Allahın əməli-saleh qullarına salam olsun. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur və şəhadət edirəm ki, Məhəmməd Onun qulu və elçisidir*] (Malik və əl-Beyhəqi. Səhih hədisdir).

## PEYĞƏMBƏRƏ SALAVAT, ONUN YERİ VƏ FORMALARI

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* birinci və başqa təşəhhüdlərdə özünə salavat deyərdi (Əbu Uvanə "Səhih (2/324) və ən-Nəsai).[77]

Bunu ümmətinə də qanun bilib salamdan sonra öyrətdiyi aşağıdakı salavatları deməyi əmr etmişdir:

1- (( اللَّهُمَّ صلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى اهلِ بيتِهِ وَعَلَى أَزْوَاجِهِ وَ ذُرِّيَّتِهِ ، كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ وَ بَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ بيتِهِ وَعَلَى أَزْوَاجِهِ وَ ذُرِّيَّتِهِ كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ )) -

**«Allahuммə salli alə Muhaммədin va alə əhli-beyтihi və alə əzvacihi va zurriyyəтihi, кəмə salleyтə alə ali İbrahiмə, innəкə həмidun мəcid. Va bəriк alə Muhaммədin va alə ali-beyтihi va alə əzvacihi va zurriyyəтihi, кəмə bəraктə alə ali İbrahiмə, innəкə**

[77] Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* salavatın mənasının ən dolğun izahını Əbu əl-Aliyə verir: "Allahın öz Peyğəmbərinə salavatı onun tərifi, sənası və təqdiri deməkdir. Mələklərin və başqalarının ona salavatını Allahdan istəmişdir. Bu istəkdən məqsəd salavatın özü deyil, ona artırılmadır. əl-Hafiz "əl-Fəqih əsərində belə bir məşhur kəlamı verir ki, Rəbbin salavatı mərhəmətdir.

**həмidun мəcid»** [*Allahım! İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Məhəmmədə, onun ailəsinə, xanımlarına, övladlarına xeyir-dua ver. Şübhəsiz ki, Sən çox həmd-səna edilən, şan və şərəf Sahibisən. İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Məhəmmədə, onun ailəsinə, xanımlarına, övladlarına bərəkət ver. Şübhəsiz ki, Sən çox həmd-səna edilən, şan və şərəf Sahibisən*].

Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm*- özü belə dua edərdi (Əhməd və ət-Tahavi səhih sənədlə).

2 - (( اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا صَلَّيْتَ عَلَى [**إِبْرَاهِيمَ وَعَلَى**] آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ . اللَّهُمَّ بَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى [**إِبْرَاهِيمَ وَعَلَى**] آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ))

**«Allahuммə salli alə Muhəммədin va alə ali Muhaммədin, кəмə salleyтə alə [İbrahiмə va alə] ali İbrahiмə, innəкə həмidun мəcid. Allahuммə bəriк alə Muhəммədin va alə ali Muhaммəd, кəмə bərəктə alə [İbrahiмə va alə] ali İbrahiмə, innəкə həмidun мəcid»** [*Allahım! {İbrahimə və} İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Məhəmmədə və onun ailəsinə də xeyir dua*

*ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən. Allahım! {İbrahimə və} İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Məhəmmədə və onun ailəsinə də bərəkət ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən*] (əl-Buxari, Müslim, ən-Nəsai, əl-Hümeydi (138/1) və İbn Mündə (68/2)).

3 - (( اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا صَلَّيْتَ عَلَى إِبْرَاهِيمَ [ وَ آلِ إِبْرَاهِيمَ] ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ . وَ بَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى [إِبْرَاهِيمَ وَ ] آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ))

**«Allahuммə salli alə Muhəммədin va alə ali Muhaммəd, кəмə salleyтə alə İbrahiмə [va ali İbrahiм], innəкə həмidun мəcid, va bəriк alə Muhəммədin va alə ali Muhaммəd, кəмə bərəктə alə [İbrahiм va] ali İbrahiмə, innəкə həмidun мəcid»** [*Allahım! İbrahimə {və onun ailəsinə} xeyir-dua verdiyin kimi, Məhəmmədə və onun ailəsinə də xeyir dua ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən. Və {İbrahimə və} İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Məhəmmədə və onun ailəsinə də bərəkət ver. Sən həqiqətən*

*həmd-sənalara layiq və şan-şövkətlisən*] (Əhməd, ən-Nəsai və Əbu Yəla, “Müsnəd əsərində (244/2). Səhih hədisdir).

4 - (( اللَّهُمَّ صلِّ عَلَى مُحَمَّدٍ [ **إِلنّبِيِّ اَلاُمِّيِّ**]، وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا صَلَّيْتَ -
عَلَى [**آلِ**] إِبْرَاهِيمَ ، وَ بَارِكْ عَلَى مُحَمَّدٍ [**إِلنّبِيِّ اَلاُمِّيِّ**] وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ
عَلَى [**آلِ**] إِبْرَاهِيمَ فِي الْعَالَمِينَ ، إِنَّكَ حَمِيْدٌ مَجِيْدٌ ))

**«Allahuммə salli alə Muhəммədin** [**ən-nəbiyyi əl-uммiyyi**] **va alə ali Muhaммədin, кəмə salleyтə alə** [**ali**] **İbrahiмə, va bəriк alə Muhəммədin** [**ən-nəbiyyi əl-uммiyyi**] **va alə ali Muhaммəd, кəмə bərəктə alə** [**ali**] **İbrahiмə, fil-aləмeynə innəкə həмidun мəcid»** [*Allahım! İbrahimə* {*ailəsinə*} *xeyir-dua verdiyin kimi,* {*savadsız peyğəmbər*} *Məhəmmədə və onun ailəsinə də xeyir dua ver. İbrahimə* {*ailəsinə*} *bərəkət verdiyin kimi,* {*savadsız peyğəmbər*} *Məhəmmədə və onun ailəsinə də hər iki dünyada bərəkət ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən*] (Müslim, Əbu Uvanə, İbn Əbi Şeybə, "əl-Müsənnəf" (2/132/1), Əbu Davud və əl-Hakim. Səhihdir).

5 - (( اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ عَبْدُكَ وَ رَسُولكَ كَمَا صَلَّيْتَ عَلَى [ آلِ] إبْرَاهِيمَ ، وَ بَارِكْ عَلَى مُحَمَّدٍ [**عَبْدُكَ وَ رَسُولكَ**] [**وَعَلَى آلِ مُحَمَّدٍ**] كَمَا بَارَكْتَ عَلَى إبْرَاهِيمَ [**وَعَلَ آلِ إبْرَاهِيم**] )) -

**«Allahuммə salli alə Muhəммədin abduкə va rasuluкə, кəмə salleyтə alə [ali] İbrahiмə, va bəriк alə Muhəммədin [abduкə va rasuluкə], кəмə bərəктə alə İbrahiмə [va alə ali İbrahiмə]»** [*Allahım! İbrahimə* {*və onun ailəsinə*} *xeyir-dua verdiyin kimi, qulun və elçin Məhəmmədə də xeyir dua ver. Və İbrahimə* {*və İbrahimin ailəsinə*} *bərəkət verdiyin kimi, qulun və elçin Məhəmmədə də bərəkət ver*] (əl-Buxari, ən-Nəsai, ət-Təhavi, Əhməd və İsmail əl-Qazi, "Fəslu-səlat alən-nəbiyyi səlləllahu əleyhi və səlləm kitabı, ikinci nəşr səh.62).

6 - (( اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَ[**عَلَى**] أزْوَاجِهِ وَ ذُرِّيَّتِهِ ، كَمَا صَلَّيْتَ عَلَى [**آلِ**] إبْرَاهِيمَ ، وَ بَارِكْ عَلَى مُحَمَّدٍ و[**عَلَى**] أزْوَاجِهِ وَ ذُرِّيَّتِهِ كَمَا بَارَكْتَ عَلَى [**آلِ**] إبْرَاهِيمَ ، إنَّكَ حَمِيدٌ مَجِيدٌ )) -

**«Allahuммə salli alə Muhaммədin va [alə] alə əzvacihi va zurriyyəтihi, кəмə salleyтə alə [ali] İbrahiмə. Va bəriк alə Muhaммədin va [alə] əzvacihi**

**va zurriyyəтihi, кəмə bəraктə alə [ali] İbrahiмə, innəкə həмidun мəcid»** [*Allahım! İbrahimə {ailəsinə} xeyir-dua verdiyin kimi, Məhəmmədə, onun xanımlarına, övladlarına xeyir-dua ver. İbrahimə {ailəsinə} bərəkət verdiyin kimi, Məhəmmədə, onun xanımlarına, övladlarına bərəkət ver. Şübhəsiz ki, Sən çox həmd-səna edilən, şan və şərəf Sahibisən*] (əl-Buxari, Müslim).

- (( اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ وَ بَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ - 7
مُحَمَّدٍ كَمَا صَلَّيْتَ وَ بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ وَ آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ))

**«Allahuммə salli alə Muhəммədin va alə ali Muhaммədin, və bəriк alə Muhəммədin va alə ali Muhaммədin, кəмə salleyтə va bərəктə alə İbrahiмə va ali İbrahiмə, innəкə həмidun мəcid»** [*Allahım! İbrahimə və İbrahimin ailəsinə xeyir-dua və bərəkət verdiyin kimi, Məhəmmədə və onun ailəsinə xeyir dua ver və Məhəmmədə və onun ailəsinə bərəkət də ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən*] (ət-Tahavi və Əbu Səid ibn əl-Arabi, səhih sənədlə).

## ÜMMƏT PEYĞƏMBƏRİNƏ SALAVATIN ƏSAS ÜSTÜNLÜKLƏRİ

*Birinci fayda.* Göründüyü kimi, Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm*- salavat deyərkən çox zaman İbrahim öz ailəsindən ayrıca zikr olunmur, yəni belə deyilir: "*İbrahimin ailəsinə salavat dediyin kimi*. Bunun da səbəbi odur ki, "ali (ailə, ocaq, nəsil, sülalə) sözü ərəb dilində həm şəxsin özünü, həm də onun ailəsindən olanları əhatə edir. Bu xüsusda Allah təala buyurur: **«Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini aləmlər üzərində üstün etdi»** *(Ali-İmran, 33)*.

Həmçinin buyurur: **«...yalnız Lutun ailəsini sübh çağı xilas etdik»** *(əl-Qəmər, 34)*.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: "*Allahım! Əbu Oufənin ailəsinə salavat de*.

Həmçinin Allah-təalənin bu mübarək ayəsindəki əhl əl-beyt ifadəsini göstərmək olar: **«...Ey ev əhli (*"əhl əl-beyt"*)! Allahın bərəkəti və mərhəməti üstünüzdə olsun...»** *(Hud, 73)*. "*Əhl əl-beyt* Peyğəmbər ailəsi olub İbrahim də ona daxildir.

Şeyxülislam İbn əl-Qayyim demişdir: “Buna görə də ifadələrin əksəriyyətində “*İbrahimin ailəsinə salavat dediyin kimi* və “*İbrahimin ailəsinə bərəkət bəxş etdiyin kimi*, bəzilərində isə “*İbrahimin* özü, namaz və zəkat dualarının orijinalında olduğu kimi işlədilir. Bəzən bu ifadələr bir yerdə də deyilir.

Bir çox alimlər arasında “*İbrahimin ailəsinə salavat dediyin kimi* və s. təşbih (bənzətmə) formasında olan ifadələr sual doğurur. Çünki əslində oxşadan oxşadılandan aşağı olur. Burada isə əksinədir, Məhəmməd *-səlləllahu aleyhi və alihi və səlləm-* (bənzədən) İbrahimdən (bənzədiləndən) üstündür. Üstün olması da onun üçün edilən salavatın digərlərinə edilən salavatdan üstün olmasını tələb edir.

Alimlər buna sayı 10-dan çox cavab vermişlər. Bunların hər biri digərindən zəifdir. Yalnız bir cavab istisnadır ki, onu mərhum şeyxül-islam İbn əl-Qayyim də bəyənmiş və xüsusi olaraq qeyd etmişdir:

“İbrahimin ailəsində peyğəmbərlər vardır. Məhəmmədin *-səlləllahu aleyhi və alihi və səlləm-*ailəsində isə peyğəmbər yoxdur. Ailəsində peyğəmbərlər olan İbrahimə edilən salavat kimi Məhəmməd *-səlləllahu aleyhi*

*və alihi və səlləm-* ailəsinə salavat deyildikdə bu salavat onun ailəsindən layiq olanlara çatır. Onun ailəsində də peyğəmbərlər yoxdur. O peyğəmbərlər üçün olunan artıq hissə İbrahimə edilən salavatla birlikdə Məhəmmədə *-səlləllahu aleyhi və alihi və səlləm-* aid olur. Beləliklə, o, başqasının nail olmadığı məziyyətlərə çatmış olur.

İbn əl-Qayyim demişdir:

"Bu verilən cavabların ən yaxşısıdır. Aşağıdakı kimi demək daha yaxşı olar: Məhəmməd *-səlləllahu aleyhi və alihi və səlləm-* İbrahim ailəsindəndir, həm də bu ailənin ən yaxşı üzvüdür. Əli bin Təlhə İbn Abbasın *–radıyallahu anhu-* Allah təalanın **«Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini aləmlər üzərində üstün etdi»** *(Ali-İmran, 33)* kəlamı barədə fikirlərini rəvayət etmişdir. İbn Abbas demişdir: "Məhəmməd *-səlləllahu aleyhi və alihi və səlləm-* İbrahimin ailəsindəndir.

Mətində belədir: "Əgər İbrahimin nəslindən olan digər peyğəmbərlərin İbrahimin ailəsinə daxil olması qəbul edilirsə, onda Rəsulullahın *-səlləllahu aleyhi və alihi və*

*səlləm-* bu ailəyə daxil olmaq haqqı daha çoxdur. Bizim "*İbrahimin ailəsinə salavat dediyin kimi* deməyimiz İbrahimin ailəsindən olan digər peyğəmbərləri də əhatə edir. Bundan sonra Allah təala ayrıca olaraq Məhəmmədə və onun ailəsinə, ümumiyyətlə, İbrahimin ailəsinin başqa üzvlərinə və Peyğəmbərin özünü də əhatə edən salavat qədərində salavat deməyi əmr etmişdir. Bu salavatdan Məhəmmədin ailəsinə onun hörməti sayəsində ona layiq olanlar çatır, bütün yerdə qalan isə Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* məxsusdur. Şübhəsiz ki, İbrahimin ailəsi ilə birlikdə Rəsulullaha *-səlləllahu aleyhi və alihi və səlləm-* deyilən salavat onlar olmadan deyilən salavatdan daha kamildir.

*İkinci fayda*. Möhtərəm oxucumuz görür ki, bu müxtəlif formalı salavatların hər birində Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* ailəsinə, qadınlarına və zürriyyətinə (övladlarına) da salavat deyilir. Buna görə də yalnız "*Allahummə! Məhəmmədə salavat de* deməklə kifayətlənmək Sünnəyə uyğun deyil və bu əzəmətli işi tamamilə həyata keçirmir. Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* buyurduğu kimi, bu salavat formalarından birinə əməl etmək zəruridir. Bu halda birinci və sonrakı

təşəhhüdlərin fərqi yoxdur. İmam əş-Şafii “əl-Umm əsərində bunu qeyd edib (1/102) deyir:

“Birinci və ikinci təşəhhüddə deyilənlər eynidir. Təşəhhüd sözünün mənası Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* şəhadət vermək və salavat deməkdir.

Şəhadətlə salavat bir-birindən ayrılmazdır. Təşəhhüd deyirəmsə demək Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* də buna daxildir. Onlar bir-birindən ayrılmazdır.

İndiki dövrdə elə alimlər vardır ki, “*Səhiheyn* (əl-Buxari və Müslim)-də Kəab bin Acra, Əbu Həmid əs-Səidi, Əbu Səid əl-Xudri, Əbu Məsud əl-Ənsari, Əbu Hureyrə, Təlha bin Ubeydullah kimi bir çox əshabələrin peyğəmbərdən “Sənə necə salavat deyək deyə soruşduqda, onun göstərilən salavat formalarını öyrədən hədislərinin olmasına baxmayaraq Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* ailəsinə salavatı inkar edirlər. Onlar Allah təalanın «...Siz də ona salavat göndərib layiqincə salamlayın» *(əl-Əhzab,56)* ayəsinə əsasən deyirlər ki, ayədə peyğəmbərdən başqasının adı zikr olunmur. Həm də əshabələrin “salat (salavat) barədə peyğəmbərdən soruşduqlarını inkar edirlər.

Çünki onlara görə namaz sözünün mənası aydındır, dua deməkdir. Bunu soruşmağları ağla batan deyil.

Bu da onların açıq aşkar səhv etdiklərini göstərir. Onlar “salat sözünün mənasını yox, məhz ona necə salavat deyilməsi barədə soruşurdular. Bu haqda yuxarıda göstərdiyimiz bir çox rəvayətlər vardır. Belə olan halda onların sualında heç bir qeyri-adilik yoxdur. Çünki onlar şəri forma barədə sual etmişlər, bu da yalnız hər şeyi Bilən və Hikmətli, şəriəti yayan (Allah) tərəfindən bilinir.

Bu Allah təalanın “Namaz qılın! (*“aqimus-salat*) ayəsinə görə fərz namaz barədə soruşmaqları kimidir. Çünki “salat sözünün lüğəvi mənalarını bilmələri, onun şəri formalarını bilmək üçün kifayət deyildir. Bu aydın və aşkar bir məsələdir.

Yuxarıda qeyd edilən iddianın heç bir əsası yoxdur. Müsəlmanlara yaxşı məlumdur ki, Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Allah kəlamını aydınlaşdıran, izah edən olmuşdur. Onun dediyi qəbul olunmalıdır. **«Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni izah edəsən...»** *(ən-Nəhl, 44)*. Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* öyrətdiyi salavatda onun ailəsinin zikri

vardır. Allah təala buyurur: **«Peyğəmbər sizə nə verirsə, onu götürün...»** *(əl-Həşr, 7)*. Səhih hədisdə Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və salləm*- dediyi sözlər məşhurdur: “*Məgər mən sizə Quranı və onun mislində olanları vermədimmi? (“Təxricul-müşkat” 163 və 4247)*.

Ey müsəlman! Quranı Sünnədən ayrılıqda öyrənmək cəhdindən özünü gözlə! Sən, hətta din sahəsində öz dövrünün Sibəveyhisi də olsan, bunu bacarmazsan. Müasir dövrün ən nəhəng dilçi alimlərinin belə Quranı Sünnəsiz başa düşə bilmədiklərinin şahidisən.

*Üçüncü fayda.* Oxucu görür ki, bu salavatla “ağa (yəni ağamız Məhəmməd) sözü yoxdur. Buna görə də sonrakı dövr alimləri bu sözün İbrahimə salavata artırılmasının şəriətə uyğunluğu barədə müxtəlif fikirdə olmuşlar. Bəziləri Peyğəmbərin -*səlləllahu aleyhi və alihi və səlləm*- təliminə sadiq qalaraq bu əlavəni inkar etmişlər. Belə ki, o, salavatı bizə belə öyrətmişdir: “Deyin! Məhəmmədə salavat deyin... Burada oxucuların nəzərinə Hafiz İbn Həcər əl-Əsqəlaninin fikrini çatdırmaq istəyirəm. O, hədis və fiqh elmlərini bir yerə cəmləmiş, Şafii məzhəbinə mənsub ən məşhur alimlərindəndir. Ancaq sonrakı dövr Şafii alimlərinin

arasında isə bu kəramətli nübuvvət təliminə müxalif fikirlər yayılmışdır.

İbn Həcərin köməkçisi olmuş mərhum Hafiz Məhəmməd bin Məhəmməd əl-Qərabili (790-835) demişdir:

“Hafiz İbn Həcərdən Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* deyilən salavatın, “ağamız ifadəsinin istər salavat daxilində, istərsə də ondan kənarda Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* aid edilməsinin vacibliyi və ya inkarı barədə soruşurlar. Məsələn, “Allahım! Ağamız Məhəmmədə və ya məxluqların ağasına, yaxud Adəm övladının ağasına salavat de demək olarmı? Yaxud qısaca “Allahım, Məhəmmədə salavat de demək olarmı? Bunlardan hansı yaxşıdır? “Ağa sözü ilə Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* xas olan sabit bir sifətin ifadə edildiyini nəzərə alıb onu işlətməliyik, yoxsa hədislərdə bu ifadənin işlənmədiyini salavatda əsas götürüb onu işlətməməliyik?

Hafiz İbn Həcər *–rahmətullahi aleyh-* bu suala belə cavab verir: “Əlbəttə, hədislərdə işlədilən ifadələrə əməl etmək daha yaxşıdır. “Ağa sözünün hədislərdə işlənilməməsi heç də Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* təvazökarlıq etməsi ilə əlaqələndirilməməlidir. Müsəlman öz

Peyğəmbərinin adını çəkəndə mütləq "*Səlləllahu aleyhi və səlləm* – "Ona Allahın salavatı və salamı olsun - deməlidir. Bunu bizə əshabələr və ardıcıllar vacib bilmişlər. İstər ilkin dövrün, istərsə də sonrakı dövrün çoxsaylı görkəmli alimləri Peyğəmbərə salavatı mütləq demişlər. Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm-* öz bağlılığı ilə məşhur olan imam əş-Şafii (Allah onun məqamını artırsın!) kitabının xütbəsində "*Allahummə, salli alə Muhəmmədin* – "Allahım, Məhəmmədə salavat de- ifadəsi ilə başlamışdır.

Qazi İyad Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* salavat barədə "əş-Şəfa əsərində danışır, orada bir çox əshabələrin və ardıcılların hədislərini də verir. Onların heç birinin ifadəsində "ağamız ifadəsi yoxdur.

Əlinin *–radıyallahu anhu-* bir hədisində deyilir ki, Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* salavatı belə öyrədirdi: "*Allahım, hərəkət edənləri hərəkətə gətirən Sənsən, uca olanları alçaldan da Sənsən, salavatını və bərəkətini yüksəlt, qulun, peyğəmbərin Məhəmmədə salamını artır! Sən açdığın qapılar bağlanmır*.

Əli *–radıyallahu anhu-* həmçinin bildirir ki, o, bu sözləri deyərmiş: "*Rəhmli və xeyirxah Allahın, Onun yaxın*

*mələklərinin salavatı peyğəmbərlərin sonuncusu və təqva sahiblərinin imamı Məhəmməd bin Abdullaha olsun*.

İbn Macənin İbn Məsuddan verdiyi bir hədisdə salavatda "seyyidul mursalin - "peyğəmbərlərin ağası - ifadəsi işlədilir. "*Allahım, öz salavatının fəzilətini, mərhəmətini və bərəkətini peyğəmbərlər ağasına şamil et*. Lakin bu, zəif hədisdir.

Bu məsələ fiqh kitablarında məşhurdur. Fəqihlərin hamısının bu məsələdə bir rəyə gəlməsi, "ağamız kəlməsinin onların heç birinin ifadələrində işlədilməməsi danılmazdır. Əgər bu ifadə müstəhəb bir əlavə olsaydı, bu onlara gizli qalmazdı və ya unutmazdılar. Bütün xeyrlər onlara tabe olmadadır. Ən çox bilən Allahdır.

Mərhum Hafiz İbn Həcərin bu sözləri barədə deməliyəm ki, onun Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- salavatına hər hansı əlavəyə qarşı çıxması və bunu Kəramətlinin əmrinə uyğun olması ilə əsaslandırması, heç şübhəsiz, mərhum alimin Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm*- bağlılığı ilə izah olunur. Allah təala buyurur: **«De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin...»** *(Ali-İmran, 31)*. Elə buna görə

imam ən-Nəvəvi “ər-Rovda (1/265-ci səh.) əsərində demişdir: Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* edilən ən kamil salavat budur: “*Allahummə salli alə Muhəmməd...* 3-cü növ salavata müvafiq olaraq “ağamız kəlməsini qeyd etməmişdir.

*Dördüncü fayda.* Bil ki, salavat formalarında birincisini, həmçinin dördüncüsünü Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* öz əshabələrinə öyrədərdi. Bunlar ən yaxşı və ən üstün formalardır ki, onları özünə və öz əshabələrinə layiq bilmişdir. Bunu hədis alimləri olan ən-Nəvəvi “ər-Rovda əsərində, habelə əs-Subki, əl-Heytəmi və başqaları da qeyd edirlər.

*Beşinci fayda.* Şəriətə görə, göstərilən salavat formalarını bir-birinə qataraq oxumaq olmaz. Belə oxumaq bidət sayılır. Bu formaların hər birindən vaxtaşırı istifadə etmək daha yaxşıdır. Şeyxülislam İbn Teymiyə “Məcmuə əsərində (69/253/1) bu məsələni araşdırır.

*Altıncı fayda.* Məşhur alim Siddiq Həsənxan “Nəzlul-əbrar bil ilmil-məsur minəl-adiyəti vəl-əzkar əsərində (səh: 161) peyğəmbərə salavat demənin və onu çox zikr etmənin fəzilətini qeyd etdikdən sonra deyir: Şübhəsiz ki,

müsəlmanlardan peyğəmbərə ən çox salavat deyən hədis əhli və sünnə rəvayətçiləridir. Çünki bu şərəfli elmdə hər dəfə hədislə qarşılaşarkən salavat demələri onların vəzifələrindəndir. Rəsulullahı *-səlləllahu aleyhi və alihi və səlləm-* zikr etməkdən dilləri daim nəm olur. Elə bir sünnə kitabı və ya növündən asılı olmayaraq bir hədis divanı, məcmuəsi, müsnədi, cüzü və s. yoxdur ki, minlərlə hədisi ehtiva etməsin. Təkcə həcminə görə ən kiçik hədis kitablarından olan əs-Suyutinin “əl-Cami əs-Sağir əsərində on min hədis vardır. Başqa hədis əsərlərini böyüklüyünü özünüz təsəvvür edin. Qiyamət günü onun şəfaətini ən çox qazanan, xoşbəxt olanlar bu nicat tapan firqə, hədis camaatıdır, peyğəmbərə qiyamət günü ən yaxın olanlardır.

Bu əməldə heç kəs onlara tay ola bilməz.

Sən də, ey xeyr istəyən, nicat axtaran! Hədisçi və ya hədislərə əməl edən olsan zərərə uğramazsan. Yoxsa... Ümumiyyətlə bundan başqa gediləcək yolda yoxdur.

Mən də dedim: Allahdan məni Rəsulullaha *-səlləllahu aleyhi və alihi və səlləm-* ən yaxın olan bu hədisçilərdən etməsini diləyirəm. Bəlkə də bu kitab mənim bu istəyimə dəlalət edir.

Bu sözləri deyən sünnə alimi imam Əhmədə Allah rəhmət etsin : “Məhəmməd peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* dini hədislərdir.

Xoşbəxt o kəsdir ki, arzusu bunları taparsa əməl etməkdir. Hədisdən və onun əhlindən üz döndərmə. (Yalnız) ağlıyla əməl etmək gecədirsə, hədislərlə əməl etmək gündüzdür.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təşəhhüd və başqa dualarda bu sözləri deməyi lazım bilmişdir: “*Hər iki rükətdə oturanda deyin: Allaha salamlar olsun (duanı axıra kimi oxuyur) və sonra duada sizə daha çox xoş olanı seçin* (ən-Nəsai, Əhməd, ət-Təbərani, İbn Məsuddan alınıb. Səhih hədisdir).

ÜÇÜNCÜ VƏ SONRA DÖRDÜNCÜ RÜKƏTƏ DURMA

Sonra Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* təkbir edib üçüncü rükətə qalxdı (əl-Buxari və Müslim), “namazı düzgün qılmayana belə etməyi buyuraraq demişdir: “*Bunu hər bir rükətdə və səcdədə icra et* (Yuxarıda deyildiyi kimi).

“*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- oturduğu yerdən durarkən təkbir deyib qalxardı* (Əbu Yəla , "Müsnəd" (284/2). Etibarlı istinaddır).

Bəzən Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* “*əllərini qaldırıb təkbir edərdi* (əl-Buxari və Əbu Davud). “*Dördüncü rükətə qalxmaq istəyəndə “Allahu əkbər” deyərdi* (əl-Buxari və Əbu Davud). Bunu yuxarıda qeyd etdiyimiz kimi “namazı düzgün qılmayana da əmr etmişdir.

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* bəzən bu təkbirlə əllərini qaldırardı (Əbu Uvanə, ən-Nəsai. Səhih istinadlıdır).

“*Sonra sol ayağı üstə oturub rahat vəziyyət alardı, bədənin bütün üzvləri öz yerini tutardı. Bundan sonra əllərini yerə basaraq durardı* (əl-Buxari və Əbu Davud).

Ayağa duranda əllərini yerə dirəyərdi.

Hər iki rükətin birində “əl-Fatihəni oxuyardı və “namazı düzgün qılmayana da bunu əmr edərdi. Zöhr namazında bu iki rükətə ola bilsin başqa ayələri də əlavə edərdi. Bu barədə “Zöhr namazı fəslində danışmışıq.

## BƏDBƏXTLİK BAŞ VERƏNDƏ BEŞ NAMAZDA QUNUT DUASINI[78] OXUMAQ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* birinə qarşı və ya biri üçün dua edəndə sonuncu rükətdə rükudan sonra qunut duasını oxuyardı.

"*O, "Səmia Allahu limən həmidəh. Allahummə rabbənə, ləkəl həmd" deyərdi* (əl-Buxari və Müslim).

"*Duasını uca səslə oxuyardı* (əl-Buxari və Müslim).

"*Əllərini qaldırardı* (Əhməd və ət-Təbərani. Səhih istinadlıdır).

"*Onun arxasındakılar "amin" deyərdilər* (Əbu Davud, əs-Sərrac, əl-Hakim. Səhih hədisdir).

"*Beş namazın hamısında qunut oxuyardı* (Əbu Davud, əs-Sərrac və əd-Dəraqutni. Etibarlı istinadlıdır).

"*Lakin o, yalnız birinə qarşı və ya biri üçün qunut tutardı* (İbn Xuzeymə, "Səhih (1/78/2). əl-Xətib, "Kitabul-qunut. Səhih hədisdir). Duanın mətninə təqribən bu sözlər

[78] Qunut sözünün mənası burada qiyamda xüsusi bir yerdə namaz vaxtı dua deməkdir.

daxil idi: “*Allahım, əl-Valid ibn əl-Validə, Səlmə bin Hişama, İyaş bin Əbi Rabiə uğur qismət elə! Allahım, Müdirrə təzyiqini artır. Onun ömrünü Yusifin çətin ömrü kimi elə! Allahım! Həyyana, Rəlana və Zəkvana Allaha və Onun Rəsuluna asi olduqları üçün lənət elə!* (Əhməd, əl-Buxari və Müslim).

“*Qunutu bitirdikdən sonra deyərdi: “Allahu əkbər” və səcdə edərdi* (ən-Nəsai, Əhməd, əs-Sərrac və Əbu Yəla. Etibarlı hədisdir).

## VİTRDƏ QUNUT

P eyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* hərdən vitr rükətində qunut tutardı. Bunu rükudan əvvəl edərdi (İbn Nasr və əd-Dəraqutni. Səhih hədisdir). Bəzən isə bunu rükudan əvvəl edərdi (İbn Əbi Şeybə (2/41/1), Əbu Davud, ən-Nəsai, Əhməd, ət-Təbərani, əl-Beyhəqi və İbn Asəakir. Səhih hədisdir).

Həsən bin Əli *–radıyallahu anhu-* öyrədir ki, vitri qurtarandan sonra deyərdi:

-(( اللَّهُمَّ اهْدِنِي فِيمَنْ هَدَيْتَ، وَعَافِنِي فِيمَنْ عَافَيْتَ، وَتَوَلَّنِي فِيمَنْ تَوَلَّيْتَ، وَبَارِكْ لِي فِيمَا أَعْطَيْتَ، وَقِنِي شَرَّ مَا قَضَيْتَ، فَإِنَّكَ تَقْضِي وَلاَ يُقْضَى عَلَيْكَ، إِنَّهُ لاَ يَذِلُّ مَنْ وَالَيْتَ، [وَلاَ يَعِزُّ مَنْ عَادَيْتَ،] تَبَارَكْتَ رَبَّنَا وَتَعَالَيْتَ ))

**«Allahuммə-h-dini fiмən hədeyтə, va afini fiмən afeyтə, va тəvalləni fiмən тəvalleyтə, va bərik li fiмə ə'тeyтə, va qıni şərri мə qadeyтə, fə innəкə тəqdı va lə yuqda aleyкə, innəhu lə yəzillu мən valeyтə, [va lə yə'izzu мən adeyтə] тəbəraктə rabbənə va тə'aleyтə»** [*Allahım! Mənə də hidayət ver, necə ki başqalarına hidayət vermisən, bütün pisliklərdən xilas et, necə ki başqalarını xilas etmisən, mənə qayğı göstər, necə ki başqalarına Qayğıkeşsən. Verdiyini mənim üçün bərəkətli et. Sənin qərarının şərindən sənə sığınıram. Şübhəsiz, yalnız Sən hökm verənsən və hökm edilməzsən. Kimi dost etsən, o hörmətdən düşməz* [*Kimi düşmən etsən, o əsla bəyənilməz*]. *Mübarəksən Rəbbimiz və Ucasan!*] (İbn Xuzeymə (1/119/2) və İbn Əbi Şeybə).

## SONUNCU TƏŞƏHHÜDÜN VACİBLİYİ

Dördüncü rükəti bitirəndən sonra Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- sonuncu təşəhhüd üçün oturardı. Birincidə etdiklərini burada da edərdi, birincidə vacib bildiklərini burada da vacib bilərdi. Lakin təvərruk oturuşu edərdi, yəni sol budu üstündə oturardı (əl-Buxari), sol ayağını sağ budunun altından keçirərdi. Əllərinin ovuc içini dizin üstünə qoyardı. Sol əlini buduna dayayaraq ona söykənərdi (Müslim və Əbu Uvanə).

Birinci təşəhhüddə olduğu kimi, bunda da Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm*- salavat demək sünnəyə uyğundur. Onların formalarını yuxarıda göstərmişik.

## PEYĞƏMBƏRƏ SALAVAT DEMƏYİN VACİBLİYİ

Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- birisinin namaz vaxtı Allahı mədh etmədiyini, Peyğəmbərə -*səlləllahu aleyhi və alihi və səlləm*- salavat demədiyini görüb demişdir: “*Bu kişi tələsir”. Sonra üzünü*

*adamlara tutub demişdir: Namaz qılanda əvvəlcə öz Qüdrət və Cəlal sahibi Rəbbinizə həmdü-səna, sonra Peyğəmbərə salavat deməlisiniz.*[79] *Bundan sonra istədiyiniz duanı oxuyun* (Əhməd, Əbu Davud, İbn Xuzeymə (1/83/2), əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

Başqa bir adamın namaz qılarkən Allaha həmdü-səna və Peyğəmbərə *-səlləllahu aleyhi və alihi və səlləm-* salavat dediyini eşidib demişdir: "*Dua et, cavab verəcək; istə, bəxş ediləcək* (ən-Nəsai. Səhih hədisdir).

## DUADAN QABAQ DÖRD ŞEYDƏN QORUNMAQ ÜÇÜN ALLAHDAN KÖMƏK DİLƏMƏYİN VACİBLİYİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* deyirdi: "*Sonuncu təşəhhüdü bitirəndən sonra Allahdan dörd şeydən qorunmaq üçün kömək istəmək lazımdır. Deyirdi:*

---

[79] Bilməlisən ki, bu hədis bu təşəhhüddə Peyğəmbərə salavat deməyin vacibliyini sübut edir. Bu vacibliyi imam əş-Şafii və imam Əhməd irəli sürmüş, onlara qədər isə əshabələr bunu demişlər. əl-Əcurri "əş-Şəriə əsərində (səh.415) yazır: "Sonuncu təşəhhüddə Peyğəmbərə salavat deməyən namazı təzədən qılmalıdır.

- (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ عَذَابِ جَهَنَّمَ ، وَمِنْ عَذَابِ الْقَبْرِ ، وَمِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ، وَمِنْ شَرِّ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ ))

**«Allahuммə inni ə‘uzu bікə мin azəbi cəhənnəм, va мin azəbi-l-qabri, va мin fiтnəтi-l-мəhyə va-l-мəмəтi, va мin şərri fiтnəтi-l-мəsihi-d-dəccəl»** [*Allahım! Cəhənnəm əzabından, qəbr əzabından, həyat və ölümün fitnəsindən, Məsih Dəccalın fitnəsinin şərindən Sənə sığınıram*]. *Bundan sonra namaz qılan özü üçün dua edir”* (Müslim, Əbu Uvanə, ən-Nəsai, İbn əl-Carud, “əl-Muntəqi (27), "əl-İrva" kitabı, (350).

“*Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- təşəhhüddə bu duanı oxuyardı* (Əbu Davud və Əhməd. Səhih hədisdir).

“*O əshabələrinə –radıyallahu anhum- Qurandan bir surə öyrədən kimi bu duanı öyrədərdi* (Müslim və Əbu Uvanə).

## SALAMDAN QABAQ DUA VƏ ONUN NÖVLƏRİ

P eyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm-*

namazda[80] müxtəlif dualar oxuyardı. Namaz qılana istədiyini seçməyi əmr etmişdir[81] (əl-Buxari və Müslim).

Bu dualar aşağıdakılardır:

1 - (( اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ . اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْمَأْثَمِ وَالْمَغْرَمِ )) -

**«Allahuммə inni ə‘uzu bікə мin azəbi-l-qabri, va ə‘uzu bікə мin fітnəті-l-мəsihi-d-dəccəl, va ə‘uzu bікə мin fітnəті-l-мəhyə va-l-мəмəті. Allahuммə inni ə‘uzu bікə мinə-l-мə‘səмi va-l-мəğraмi»** [*Allahım! Qəbr əzabından Sənə sığınıram, Məsih Dəccalın fitnəsindən Sənə sığınıram, həyat və ölümün fitnəsindən Sənə sığınıram.*

[80] təşəhhüddə deməməyimizin səbəbi məhz namaz kəlməsinin işlənməsidir. Bu da yalnız təşəhhüddə deyil, digər yerdə də dua etməyə dəlalət edir.

[81] Əl-Əsrəm yazır: "Əhmədə dedim: Təşəhhüddən sonra necə dua edirsən. Cavab verdi ki, hədislərdə deyildiyi kimi. Ona dedim: Məgər Rəsulullah *-səlləllahu aleyhi və alihi və səlləm-* deməmişdir ki, istədiyin duanı seç. O cavab verdi ki, hədisdə verilənlərdən seç. Duanı onun yadına saldım. Dedi ki, bu hədisdə yoxdur.

*Allahım! Günaha və borca düşməkdən*[82] *Sənə sığınıram*] (əl-Buxari və Müslim).

2 - (( اللهم إنى أعوذ بك من شر ما عملت ومن شر ما لم أعمل)) **«Allahuммə inni ə‘uzu biкə мin şərri мə aмilтu va мin şərri мə ləм ə‘мəl»** [Allahım! Etdiyim və etmədiyim əməllərin şərindən Sənə sığınıram] (ən-Nəsai və İbn Əbi Asim. Səhih hədisdir).

3 - (( اللهم حاسبنى حسابا يسيرا )) **«Allahuммə həsibni hisəbən yəsi'ra»** [Allahım, (Qiyamət günü) mənimlə çəkdiyin haqq-hesabı yüngül et!] (Əhməd, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

4 - ((اللهم بعلمك الغيب ، وقدرتك على الخلق ، احيني ما علمت الحياة خيرا لي ، وتوفني اذا كانت الوفاة خيرالي ، اللهم واسالك خشيتك في الغيب والشهادة ، واسالك كلمة الحق، و العدل في الغضب والرضى، واسالك القصد في الفقر والغنى ، واسالك نعيما لا يبيد ، واسالك قرة عين لا تنفد و لا تنقدطع ، واسالك الرضى بعد القضاء ، واسالك برد العيش بعد الموت واسالك لذة النظر الى وجهك ، واسالك الشوق

---

[82] Aişə rəvayət etmişdir: Bir nəfər soruşur: "Nəyə görə sən daha çox borcdan Allaha sığınırsan, ya Rəsulullah? O belə deyir: "Adam borc götürəndə bir hadisə baş versə yalançı çıxar, öz vədinə xilaf olar".

الى لقاءك ، في غير ضراء مضرة ، ولا فتنة مضلة، اللهم زينا بزينة الايمان واجعلنا هداة مهتدين))

**«Allahuммə bi-ilмікəl-ğeybə va qudraтікə aləl-xəlq, əhyini мə alімтə-l-həyaтə xeyran li, va тəvaffəni izə кənəт əl vəfaтi xeyran li. Allahuммə va əs-əluкə xəşyəтəкə fil-ğeybi vaş-şəhadə, va əs-əluкə кəliмəтəl-haqqi val-adlə fil-ğadabi var-rıda, va əs-əluкə əl-qasdə fil faqri val-ğina, va əs-əluкə nəiмən lə yəbid, va əs-əluкə qurraтə aynin [lə тənfəd va] lə тənqaтi'ı, va əs-əluкə ər-rıda bə'dəl-qada va əs-əluкə bardə əl-iyşi bə'dəl-мovт, va əs-əluкə ləzzəтə van-nəzarə ilə vachiкə, va [əs-əluкə] əş-şövqa ilə liqaiкə fi ğeyri darrain мudirrəh, va lə fiтnəтən мudilləh. Allahuммə zəyyinnə bi zinəтil-iмan, vac'alnə hudəтə мuhтədin»** [Allahım! Sənin qeybi elminlə və yaratdıqlarının üzərindəki qüdrətinlə həyat mənə xeyirlidirsə məni yaşatmağını, əgər ölüm mənə xeyirlidirsə, məni öldürməyini diləyirəm. Allahım! Gizli və aşkarda Sənin qorxunu diləyirəm, Qəzəb və razılıq halında haqq sözü və adilliyi diləyirəm, kasıblıq və varlılıq zamanı Sənin qəsdini

diləyirəm, Səndən sonsuz nemət diləyirəm, gözümə bitməz-kəsilməz nur diləyirəm. Sənin qəzavü qədərinə razı olmağımı diləyirəm, ölümdən sonra həyat sərinliyini diləyirəm. Sənin camalına baxmaq ləzzətini diləyirəm. Zərər verən bədbəxtliyin, yol azdıran fitnənin olmadığı bir yerdə Səninlə görüşmək şövqini diləyirəm. Allahım! Bizi iman zinəti ilə zinətləndir. Bizi doğru yola yönəldənlərdən et!] (ən-Nəsai, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

5 - Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* Əbu Bəkrə *–radıyallahu anhu-* bu duanı öyrətmişdi:

- (( اللَّهُمَّ إِنِّي ظَلَمْتُ نَفْسِي ظُلْمًا كَثِيرًا ، وَلاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ ، فَاغْفِرْ لِي مَغْفِرَةً مِنْ عِنْدِكَ وَارْحَمْنِي ، إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ ))

**«Allahuммə inni zaləмтu nəfsi zulмən кəsiran, va lə yəğfiru-z-zunubə illə əнт, fəğfirli мəğfiratən мin indiкə varhaмni, innəкə əнтə-l-ğafuru-r-rahiм»** [*Allahım! Mən özümə çox zülm etmişəm. Günahları bağışlayan yalnız Sənsən. Məni öz məğfirətinlə bağışla. Mənə rəhm elə. Sən həqiqətən Bağışlayan və Rəhmlisən*] (əl-Buxari və Müslim).

6 - Aişəyə *–radıyallahu anhə-* bunları deməyi əmr etmişdi:

– (( اللهم إنى أسألك من الخير كله عاجله وآجله ما علمت منه وما لم أعلم وأعوذ بك من الشر كله عاجله وآجله ما علمت منه وما لم أعلم. اللهم إنى أسألك من خير ما سألك عبدك ونبيك وأعوذ بك من شر ما استعاذ بك منه عبدك ونبيك. اللهم إنى أسألك الجنة وما قرب إليها من قول او عمل وأعوذ بك من النار وما قرب إليها من قول او عمل وأسألك أن تجعل كل قضاء قضيته لى جيرا ))

**«Allahuммə inni əs-əlukə мinə-l-xeyri кullihi əcilihi va acilihi мə aliмтu мinhu va мə ləм əa‘ləм va əuzu biкə мinə-ş-şərri кullihi əcilihi və acilihi мə aliмтu мinhu va мə ləм əa‘ləм. Allahuммə inni əs-əlukə мin xeyri мə sə-ələкə abduкə va nəbiyyuкə va əuzu biкə мin şərri мə-s-тəazə biкə мinhu abduкə va nəbiyyuкə. Allahuммə inni əs-əlukə-l-cənnəтə va мə qarrabə ileyhə мin qaulin au aмəl va əuzu biкə мinə-n-nəri va мə qarrabə ileyhə мin qaulin au aмəl va əs-əlukə ən тəcalə кullə qadain qadayтəhu li xeyran»** [*Allahım, bildiyim və bilmədiyim, tez və gec olan bütün xeyirləri Səndən diləyir, bildiyim və bilmədiyim, tez və*

*gec olan bütün şərlərdən Sənə sığınıram. Allahım, qulun və peyğəmbərinin (Məhəmməd – s.a.v.) Səndən istədiklərini Səndən diləyir və sığındığı şərlərdən Sənə sığınıram. allahım , cənnəti və ona yaxınlaşdıran hər bir söz və əməli Səndən diləyir, Cəhənnəmdən və ona yaxınlaşdıran hər bir söz və əməldən Sənə sığınıram. Səndən mənim üçün yazdığın hər bir hökmün xeyrli olmasını diləyirəm*] (Əhməd, ət-Təyalisi, əl-Buxari, İbn Macə, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

7 - Birisindən soruşur: “*Namazda nə deyirsən?” Cavab verir: “Şəhadət edirəm, sonra Allahdan Cənnət diləyirəm, Oddan qorunmaq üçün Ona pənah aparıram”. Peyğəmbər -səlləllahu aleyhi və alihi və səlləm- deyir: “Biz də elə bunu deyirik”* (Əbu Davud, İbn Macə və İbn Xuzeymə, səhih sənədlə).

8 – Eşitdi ki, birisi təşəhhüddə bunları deyirmiş:

- (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ يَا أَللهُ بِأَنَّكَ الْوَاحِدُ الأَحَدُ الصَّمَدُ الَّذِي لَمْ يَلِدْ وَلَمْ يُولَدْ وَلَمْ يَكُنْ لَهُ كُفُوًا أَحَدٌ ، أَنْ تَغْفِرَ لِي ذُنُوبِي ، إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ ))

**«Allahummə inni əs-əlukə yə Allahu bi ənnəkə-l-vahidu-s-saməd əl-ləzi ləm yəlid va ləm yuləd va ləm yəkun ləhu kufuvan əhəd, ən tağfira li zunubi, innəkə**

**əntə-l-ğafuru-r-rahiм»** [*Allahım, Sən Vahidsən, Birsən, hər şey Sənə möhtac olan Özünsə heç nəyə möhtac olmayan, doğulmayan və doğmamışsan, Sənin heç bir bənzərin yoxdur, Səndən günahlarımın bağışlanmasını diləyirəm. Şübhəsiz, Sən Bağışlayan-Rəhimlisən!*]. Bunu eşidən Peyğəmbər -*səlləllahu aleyhi və alihi və səlləm*- dedi: “*O bağışlandı! O bağışlandı!”* (Əbu Davud, ən-Nəsai, Əhməd, İbn Xuzeymə, əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).

9 - Başqa birisi təşəhhüddə deyirmiş:

– (( اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ بِأَنَّ لَكَ الْحَمْدَ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ، وَحْدَكَ لاَ شَرِيكَ لَكَ، الْمَنَّانُ،

يَابَدِيعَ السَّمَوَاتِ وَالأَرْضِ، يَا ذَا الْجَلاَلِ وَالإِكْرَامِ، يَا حَيُّ، يَا قَيُّومُ، إِنِّي أَسْأَلُكَ الْجَنَّةَ وَأَعُوذُ بِكَ مِنَ النَّارِ ))

**«Allahuммə inni əs-əluкə bi ənnə ləкə-l-həмd, lə iləhə illə ənт vahdəкə lə şəriкə ləкə, əl-мənnən, yə bədi‘a-s-səмəvaтi va-l-ard, yə zə-l-cələli va-l-iкraм, yə hayyu yə qayyuм, inni əs-əluкə-l-cənnəтə va ə‘uzu biкə мinə-n-nər»** [*Allahım!Səndən diləyirəm. Həmd Sənə məxsusdur, Səndən başqa ibadətə və itaətə layiq*

*haqq məbud yoxdur. Təksən və şəriksizsən, Səxavətlisən. Ey səmaların və yerin Yaradanı! Ey əzəmət və kəramət Sahibi, ey daimi və əbədi olan, hər şeyi idarə edən Səndən cənnəti diləyirəm və Oddan Sənə sığınıram!*].

Bu sözləri eşidən Peyğəmbər *-səlləllahu aleyhi və alihi və sælləm-* öz əshabələrinə deyir: "*Eşitdiniz nə dua etdi?" Dedilər: "Allah və Onun Rəsulu bilir". O dedi: "Vallah, bu kişi Allahı Onun əzəmətli adı ilə çağırırdı. Bununla Allaha müraciət edən cavab alacaq, istədiyi ona veriləcəkdir"* (Əbu Davud, ən-Nəsai, Əhməd, əl-Buxari, ət-Təbərani və İbn Mundə. Səhih istinadlıdır).

10 – Təşəhhüd və salam arasında deyərdi:

- (( اللَّهُمَّ اغْفِرْ لِي مَا قَدَّمْتُ ، وَمَا أَخَّرْتُ ، وَمَا أَسْرَرْتُ ، وَمَا أَعْلَنْتُ ، وَمَا أَسْرَفْتُ ، وَمَا أَنْتَ أَعْلَمُ بِهِ مِنِّي . أَنْتَ الْمُقَدِّمُ ، وَأَنْتَ الْمُؤَخِّرُ ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ ))

**«Allahuммə-ğfirli мə qaddəмтu, va мə əxxərтu, va мə əsrarтu, va мə əa'lənтu, va мə əsrafтu, va мə əнтə əa'ləмu bihi мinni. Əнтə-l-мuqaddiмu, va əнтə-l-мuəxxiru, lə iləhə illə əнт»** [*Allahım! Etdiyim və edəcəyim, gizli və aşkar işlərim, israf etdiyim və məndən daha yaxşı bildiyin günahları bağışla. Əvvəl və axır Sənsən. Səndən*

*başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur*] (Müslim və Əbu Uvanə).

## TƏSLİM (SALAM VERMƏK)

Bundan sonra Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* üzünü sağa tutub salam verərdi: "*Əs-səlamu əleykum və rahmətullahi* [Allahın salamı və rəhməti olsun Sizə]. *Bu vaxt sağ yanağının ağartısı görünərdi. Sonra sol tərəfə üzünü tutub bunu deyərdi. Bu vaxt sol yanağının ağartısı görünərdi* (Müslim, Əbu Davud, ən-Nəsai və ət-Tirmizi. Səhih hədisdir).

"*Bəzən bu salama "və bərəkatuhu"* [və Onun xeyir və bərəkəti] *sözünü artırardı* (Əbu Davud, İbn Xuzeymə, Əbdül Haqq, ən-Nəvəvi, İbn Həcər və b. Səhih hədisdir).

"*Sağa üz çevirib "əs-səlamu əleykum və rahmətullahi" deyirdisə, sola salam verəndə bəzən daha qısa şəkildə deyərdi: "Əs-səlamu əleykum"* (ən-Nəsai, Əhməd və əs-Sərrac. Səhih hədisdir). *Bəzən də qısa və tək sağ tərəfə salamla kifayətlənərdi. "Əs-səlamu əleykum" - deyib üzünü bir qədər sağa çevirərdi.*

Bəziləri salam verəndə sağa və sola əlləri ilə işarə də edərdilər. Rəsulullah *-sələllahu aleyhi və alihi və səlləm-* bunu görüb demişdir: “*Nə üçün əllərinizlə işarə edirsiniz? Əlləriniz elə bil bədöy atların quyruğudur, qalxıb yellənir. Salam verəndə yoldaşınıza üz tutun. Əlinizlə göstərməyin*!.

Bundan sonra Onunla namaz qılanlar daha belə etmədilər. Rəvayətdə həmçinin deyilir: “*Namaz qılanın əlini dizinə qoyması, sonra sağda və solda oturan qardaşına salam verməsi kifayətdir* (Müslim, Əbu Uvanə, əs-Sərrac, İbn Xuzeymə və ət-Təbərani).

## SALAMIN VACİBLİYİ

Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* demişdir: “*Namazın təhlili (sonu) salamdır* (əl-Hakim və əz-Zəhəbi. Səhih hədisdir).



## SON SÖZ

P eyğəmbərin *-səlləllahu aleyhi və alihi və*

*səlləm-* qılmış olduğu namaz barədə sizə təqdim etdiyimizin hamısı həm kişilərə, həm də qadınlara aiddir. Sünnədə qadınlar üçün bəzi istisnalar barədə heç nə deyilmir. Əksinə, Peyğəmbərin *-səlləllahu aleyhi və alihi və səlləm-* dediyi hamı üçün aydındır: "*Mənim kimi namaz qılın. Necə görmüşsünüzsə, elə də namaz qılın*. Bu sözlər qadınlara da aiddir. İbrahim ən-Nəxəvi demişdir: "*Qadın namazda kişinin etdiklərini edir* (İbn Əbi Şeybə bunu səhih istinadla verir). Qadının kişidən fərqli bir şəkildə səcdə etməsi barədə hədis doğru deyildir. Əbu Davud Yezid bin Əbi Həbibə istinadən deyir ki, *qadın səcdədə özünü bir qədər bükməlidir*. Bu da zəif hədislərdəndir.

İmam Əhmədin İbn Ömərə istinad verdiyi hədisdə deyilir ki, *onun qadınlarına namaz vaxtı bardaş qurub oturmağı* əmr etməsi barədə hədisi zəifdir. Əl-Buxari "ət-Tarix əs-səğir əsərində səhih istinadla Umm əl-Dərda barədə belə yazır: "*O, namazda kişi kimi oturardı. O, fəqih bir qadın idi*.

Bunlar təkbirdən təslimə qədər Peyğəmbər *-səlləllahu aleyhi və alihi və səlləm-* namazı barədə toplaya bildiklərimizdir. Allah təaladan bunu öz kəramətli camalına

sədaqət ifadəsi, mərhəmətli və şəfqətli Rəsulunun sünnəsinə hədiyyə bilməyi rica edirəm.

*Pak və nöqsansız Allaha alqışlarla və Onun həmdi ilə! Allahım, Sən pak və nöqsansızsan və həmd Sənə məxsusdur! Şəhadət verirəm ki, Səndən başqa ibadət haqqı olan tanrı yoxdur. Səndən bağışlanma diləyirəm və Sənə tövbə edirəm!*

*Allahım! İbrahimə və İbrahimin ailəsinə xeyir-dua və bərəkət verdiyin kimi, Məhəmmədə və onun ailəsinə xeyir dua ver və Məhəmmədə və onun ailəsinə bərəkət də ver. Sən həqiqətən həmd-sənalara layiq və şan-şövkətlisən!*



# KİTABIN İÇİNDƏKİLƏR

*Mövzular:* *səh.*